Hazırlayan:

**Elçin Zamanov**

Ədəbi redaktor:

**Rafiz Manafov**

Nəşrə hazırlayan:

**Rüfət Şirinov**

İç dizayn:

**Əhməd Babayev**

**Əflatun Məmmədov**

Qapaq tərtibatı:

**Nicat Qəribov**

Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin **10 may 2016-cı il DK-416/M** nörməli razılıq məktubu ilə nəşr edilmişdir.

**Bakı-2016; İpəkyolu Nəşriyyatı: 195**
**İSBN: 978-9952-8297-4-7**

**İPƏKYOLU NƏŞRİYYATI**

Bakı Şəhəri Səbail Rayonu
Cəfərov Qardaşları, 16.
Tel: (+994 12) 492 14 38
Mobil: (+994 51) 412 22 82
Web sayt: www.ipekyolunesriyyati.az
Elektron poçt: ipekyoluneshriyyati@gmail.com

***"Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin."***

*(Həşr surəsi, 59/7)*

*Əsla, birinizə məndən bir əmir və ya qadağa nəql edilərsə,"biz Allahın kitabında nəyi tapsaq ancaq ona tabe olarıq"- deyənlərdən olmayın!*

*(Əbu-Davud, Sünnə 5)*

## MÜNDƏRİCAT

## IV FƏSİL / AZƏRBAYCANDA DİN

## ÖN SÖZ

Rəhman və Rəhimli olan Allahın adıyla

Tarixdə və günümüzdə hər hansı bir dini və ya inancı mənimsəməyən insana rast gəlinsə də, dini olmayan bir topluma rast gəlinməz. Bu gerçəklik bizə dinin, toplumlar və insanlar üçün təbii ehtiyac olduğunu göstərir. Bəşəriyyət varlığını davam etdirdiyi müddətcə din də öz varlığını sürdürəcəkdir.

İnsanlığın ayrılmaz bir hissəsi olan dinləri araşdırmaqla məşğul olan elm sahəsi Dinlər Tarixidir. Dinlər Tarixi, tarix və filologiya elmlərindən bəhrələnərək yer üzündə mövcud olan, hal-hazırda yaşayan və ya yaşamayan, heç bir davamçısı qalmayan din və inancları incələyir. Müxtəlif dinlər arasındakı tarixi əlaqələri açıqlamağa çalışır.

Orta təhsil mərkəzlərində tədris üçün hazırlanmış olan bu kitab dörd fəsldən ibarətdir.

Birinci fəsldə, dinin tərifi, dinə olan ehtiyac, dinin faydaları, din və elm arasındakı münasibət, dinin qaynağı, din və mifologiya, ilk insanın dini kimi mövzulardan bəhs edilir.

İkinci fəsldə, dinlər tarixinin qısa metodologiyasından bəhs edərək, dinlər tarixinin tərifi, mövzusu, metodu, digər elmlərlə münasibəti və dinlər tarixi sahəsində qələmə alınmış əsərlər kimi mövzulara yer verdik

Üçüncü fəsil, əsasən dinlərin təsnifatını əhatə edir. Bu fəsldə dinlər ən qədim ibtidai dinlər, hind dinləri, yeni dini cərəyanlar, Çin və Yapon dinləri və İlahi dinlər olaraq sinifləndirilmişdir. Dinlər sinifləndirilərkən mövzu içərisində onların inanc-əxlaq sistemi, ibadət şəkillərinə və məzhəblərinə ayrı-ayrılıqda yer verilmişdir. Həmçinin ilahi dinlər digər dinlərə nisbətən daha geniş ələ alınmışdır.

Dördüncü fəslə isə Azərbaycanda mövcud olan dini anlayış, Azərbaycanda mövcud olan dinlər və təriqətlər, dini dözümlülük, dinlərarası dialoq, şeyxülislamlıq və onun tarixi kimi mövzular daxil edilmişdir.

Müvəffəqiyyət Allahdandır. Qüsursuz olan tək olan Allahdır. Təbii ki bu gördüşümüz bu işin də qüsurları olacaqdır. Buna görə də bəri başdan bu kitabı oxuyacaq olan bütün oxuculardan qarşılaşdıqları nöqsanları tərəfimizə bildirmələrini xahiş edirəm. Bu işin tamamlanmasını müvəffəq edən Uca Allah həmd edir və bu kitabın bəşəriyyətdə mövcud olmuş dinlərin tarixinin topluma tanıtdırılmasında faydalı olacağına ümid bəsləyirəm. Kitabın ərsəyə gəlməsi müddətində hər cür yardımını, səbir və təhəmmülünü əsirgəməyən ailəmə, elmi və ədəbi redaktorluğunu edən, nəşrə hazırlayan, dizayn işlərini görən hər kəsə, dərin təşəkkürümü bildirirəm.

**Elçin Zamanov**

# I FƏSİL

# DİN NƏDİR



**HAZIRLIQ TAPŞIRIQLARI**

1. Din termini haqqında müxtəlif kitablardan məlumat toplayın.
2. “İlk insanda dini təsəvvür necə ola bilər?” mövzusunda fikirlərinizi yazın.
3. “Bugünkü cəmiyyətimizdə din deyiləndə ilk öncə ağla nə gəlir?” mövzusunda araşdırma edin.
4. “Həyatda din olmazsa nə olardı?” mövzusunda elmi müzakirə aparın.
5. Qurani-Kərimdə Bəqərə surəsi 213-cü ayəni oxuyun və mənası üzərində düşünün.

## I. DİN NƏDİR?

Hər gün ayrı-ayrı dinlərə etiqad edən müxtəlif insanlarla qarşılaşırıq. Məsciddə müsəlmanları rüku və səcdə edərək namaz qılarkən, kilsədə xristianları xaç çəkərək dua edərkən, sinaqoqda yəhudiləri başlarını örtərək qədim dillərində Yaradana həmd-səna edərkən görürük. Xristianlar bazar gününü, yəhudilər şənbə gününü, müsəlmanlar isə cümə gününü müqəddəs gün hesab edirlər.

Bütün bunlar dini etiqad formalarının müxtəlifliyinə dəlalət edir. Bəs görəsən, din nədir, onun tanıdığımız və tanımadığımız hansı formaları vardır?

**QEYD EDİN:**

Din kəlməsi ibrani dilində qanun və hökm mənasına gələn "dat", islamdan əvvəl Türkcədə "darm" və ya "nom", Avropa dillərinin çoxunda, Latıncada hörmət və diqqətlilik mənasına gələn "religion" kəlmələri ilə ifadə olunur.

Din- insanları hiss üzvləri ilə dərk edilən dünya gerçəkliyi arxasındakı daha əhəmiyyətli gerçəkliklə bağlayan yoldur. Bu yol insanlara gözəl əxlaq sahibi olmağı, yaxşılıq etməyi, pislikdən çəkinməyi öyrədən Allah yolu, həmçinin Allah sevgisinə qovuşduran yoldur.

Dinin yolu böyük, qolları, cığırları çoxdur. Tanıyıb-bildiyimiz və bilmədiyimiz dinlər bu yolun qollarıdır. Bu dinlərdən bəzilərinin öz müqəddəs kitabları, peyğəmbərləri, tarixi ənənələri, bəzilərinin isə dəqiq müəyyən edilmiş dini mənsubiyyət göstəriciləri olmasa da, özünəxas dua və ibadət terminləri vardır.

### A. Dinlər Niyə Mövcuddur?

Din insanın hiss üzvləri ilə qavranılmayan, gözəgörünməz gerçəkliyi tanıyıb öyrənmək ehtiyacından ortaya çıxan hadisədir; həmin gerçəkliyi tanıyıb, onu öyrənmək yolu olduğu üçün mövcuddur. İnsanın bir çox digər ehtiyacları da din vasitəsilə ödənilir.

**DÜŞÜNÜN**

Qurani-Kərimdə keçən "Mən insanları və cinləri yalnız mənə qulluq etsinlər deyə yaratdım" (Zariyat surəsi -56) ayəsi ətrafında düşünün.

İnsan əbədiliyə ehtiyac duyur. İnsan dünya həyatında hər şeyin ötəri, keçəri olduğunu görür; doğulur, yaşa dolur, qocalır, ölür; gec-tez fanilik hər şeyi bürüyür. Əgər insan dünya həyatı ilə hər şeyin bitdiyini düşünsə, ölüm qorxusu hər cür həyat sevincini onun əlindən alar, onun əməlləri mənasını itirər, yaşamaq çətinləşər, insan birgəyaşayışı mümkün ol-

maz, insan insana düşmən kəsilər, güclü zəifi əzər. Din isə öyrədir ki, bu müvəqqəti dünya həyatından başqa, əbədi axirət həyatı da vardır, əbədi cənnət səadəti yer üzündə yaxşı əməllər sayəsində qazanılır. Din əbədiliyə inam tərbiyə etməklə insanın bu dünyadakı həyatına məna verir, onu axirət həyatının astanası kimi izah edir, hər iki aləm arasında körpü salır, insanın nə məqsədlə xəlq edildiyini (yaradıldığını), xeyirin və şərin mənasını açıqlayır! İnsan birgəyaşayışına imkan yaradır.

Digər tərəfdən insan kamilliyə can atır. Lakin o biri dünyada kamilliyə qovuşmaq mümkün deyildir. Bu dünyada hər hansı bir şey nə qədər gözəl olsa da, ondan yaxşısını təsəvvürə gətirmək mümkündür. Əsl kamillik nümunəsini din göstərir. Dini təcrübə kamil Allah sevgisinə, kamil əzəli həqiqətə yol açır.

İnsan gözə görünməyən ruhani gerçəkliyə yaxınlıq axtarır. Onun yerinə yetirdiyi ayin və ibadətlər, oxuduğu dualar, kəsdiyi qurbanlar, verdiyi nəzirlər, etdiyi yaxşılıqlar yalnız özünü Allaha yaxınlaşdırmaq məqsədi güdürsə, o mənən saflaşır, paklaşır, kamilləşir.

Din sürətli dəyişikliklər, ciddi ekoloji problemlər, təbiətdə müşahidə olunan hadisələr şəraitində insana əmin-amanlıq, yəqinlik gətirir. Onun həyatına və əməllərinə məna verir. Din bütün bu tələbatlara cavab verdiyi üçün mövcuddur.

### B. Dinə Olan Ehtiyac Və Dinin Faydaları



Dini dəyərlərə riayət edən bir cəmiyyət dinsiz cəmiyyətə nisbətən daha sağlam və daha xoşbəxt bir həyat sürür.

Məlum bir həqiqətdir ki, hər bir cəmiyyətdə insan maraqlarının toqquşması baş verir. Bunun qarşısını almaq, cəmiyyəti dağılmaqdan, xaosdan və qarşıdurmadan qorumaq üçün qanunlar məcəlləsi hazırlanır. Qanunlar hər xalqın mədəniyyətinə, intellektual səviyyəsinə, milli-mədəni xüsusiyyətlərinə və dövlət quruluşuna uyğun olur. Bəşəriyyət tarixində qanunsuz və ənənəsiz cəmiyyət olmamışdır.

Dinsiz insan dünyəvi qanunları yalnız qüvvədə olduqları zaman gözləyir. Polisin və başqa qanun gözətçilərinin gözündən uzaq olduqda isə tamamilə sərbəst şəkildə öz cinayətkar əməllərini davam etdirmək fürsəti qazanır. Belə şəraitdə ona mane ola biləcək qüvvə yoxdur.

Halbuki, din insan üzərində əsas nəzarəti onun öz daxilindəki gözətçiyə tapşırır. Bu nəzarətçi- Allaha iman və onun cəzasından qorxu hissidir. Çünki, hər şeyi bilən, görən və eşidən qüdrətli Allah insanın nəinki əməllərindən, hətta niyyətlərindən də agahdır.

**İZAH EDİN!**

*“Nə irfandır verən əxlaqa yüksəklik nə vicdandır,*
*Fəzilət hissi insanlarda Allah qorxusundandır.”*

Məhməd Akif Ərsoy

Sizcə bu misralarda bəhs olunan fikir nədir?

Fikrimizi izah etmək üçün bir misala nəzər salaq: Dünyəvi qanunlar insanın iqtisadi və maliyyə fəaliyyətində oğurluq, əliəyrilik, başqasının əmlakını mənimsəmə kimi halların qarşısını alsa da, israfçılıq kimi bəlaları islah etməkdə acizdir. Halbuki, “*Yeyin, için, amma israf etməyin, şübhəsiz ki, Allah israf edənləri sevməz.*” (Əraf surəsi, 31-ci ayə) əmri ilə din bu barədə öz hökmünü qoymuşdur.

Dindar və qeyri-dindar cəmiyyətlər arasındakı başqa bir fərq bundan ibarətdir. Dindar insan həyatın yalnız bu dünyadakı bir neçə on illiklə sona çatmadığına inanır. Axirət aləminə inanan şəxs bu dünyadakı müvəqqəti çətinliklərə dözür. O, hər şeyə səbir və təmkinlə yanaşır, bütün əməllərin qarşılığını qiyamət günündə alacağına inanıb, bir an da olsa özünə nəzarət etməyi unutmur.

**C. Dinin Qaynağı Haqqında Görüşlər**

Dinin nə vaxt, necə ortaya çıxdığı, qaynağının nə olduğu barəsində müqəddəs kitabların verdiyi məlumatların xaricində başqa tarixi bir məlumat yoxdur. Dinin qaynağı haqqındakı görüşləri darvinist və vəhy təməlli olmaqla iki qrupda dəyərləndirmək olar.




**1. Darvinist görüş.**

Dinlərin müəyyən zaman aralıqlarında müxtəlif səbəblərə bağlı olaraq (yəni vəhy qaynaqlı deyil) ortaya çıxaraq yayılmasını iddia edən görüşə darvinist görüş deyilir.

XIX əsrdə dünyada mövcud olan dinlərin kökünün araşdırılması üçün işlər görüldü. Bu araşdırılmalar nəticəsində ortaya beş fərqli görüş çıxdı. Bu görüşlərə görə insanlar qorxu, günahkarlıq duyğusu, atalara bəslənən hörmət və başqa şeylərdən dolayı dinə yönəlmişlər. XIX əsrin sonları və XX əsrin əvvəllərində həyata keçirilən araşdırmaların nəticələri darvin teoreminin lehine izah olundu. Darvinistlər artıq insanın, həyatın, təbiətin və canlı varlıqların sirlərinin aşkar olunacağını iddia edirdilər. Qısaca, din artıq, insanın həyatından çıxacaq və yerini elmə tərk edəcəkdi. Lakin darvinistlərin bu xəyalları qısa zaman içərisində suya düşdü. Çünki, darvinistlər öz fikirlərini isbat etmək üçün qədim qəbilələr arasına gedərək heç bir araşdırma aparmamışdılar. Onlar fikirlərini səyyah və misyonerlərin raporlarına əsaslanaraq irəli sürmüşdülər. Dinin qaynağı ilə əlaqəli darvinist görüşlər tənqid edilməyə başlandı və dinin əsl qaynağı ilə əlaqəli araşdırmalar aparıldı. Nəticədə ilk insanın dininin tək Allah inanclı olduğu isbat olundu.

**2. Vəhy təməlli görüş**

Dinin qaynağı ilə əlaqəli vəhy təməlli görüşə görə din, Allah tərəfindən vəhy yoluyla insanlar arasından seçdiyi peyğəmbərlərə göndərilən ilahi qanunlardan ibarətdir. İslam alimlərinə görə, dinin qaynağı qəti olaraq vəhydir. Din, Hz. Adəmlə başlayıb Hz. Məhəmmədin (s.ə.s) peyğəmbərliyi ilə tamamlanmışdır. Bu dinin ümumi adı, İslamdır. Müsəlman alimlər dinləri, qaynağı baxımından "ilahi və " bəşəri dinlər" olaraq iki yerə bölmüşdürlər. İlahi dinlər Yəhudilik, Xristianlıq və İslamdır. Ancaq yəhudilik və xristianlıq dinlərinin qaynağı ilahi olsa da, bugün İslam nöqteyi-nəzərindən təhrif olunmuşdur. Bu üç dinin xaricində qalan dinlər isə bəşəri dinlər olaraq qəbul edilir.

Nəticə olaraq, dinin qaynağı, Allahdır. Peyğəmbər daxil olmaqla heç bir bəşər din yarada bilməz.

### D. Elm Və Din Arasındakı Münasibət

İnsan yarandığı vaxtdan etibarən din həmişə mövcud olmuşdur. Amma XVII əsrdə müasir elm Qərbdə inkişaf etməyə başlayanda bəziləri dini qeyri-elmi şüur forması kimi rədd etdilər. Bunun səbəbi o idi ki, Qərb elmi özünü xalis materiya ilə, dini isə başdan-ayağa ruh ilə bağlayırdı. Kainatın gözə görünən fiziki reallığı müstəqil bir aləm, nəhəng bir maşın kimi nəzərdən keçirilir və belə hesab olunurdu ki, bu maşını hissələrə bölmək, dərk etmək və insanların istədiyi kimi istifadə etmək olar. Ruhun varlığı yaratmasına, ona nüfuz və ya müdaxilə etməsinə inam rədd edilirdi, çünki ruh duyulmur, onu elmi metodlarla təsdiq etmək olmaz. Lakin insanlar tezliklə başa düşdülər ki, din ilə elmi bu cür sərt qarşı-qarşıya qoymaq düzgün deyildir. Əgər elm dünya haqqında əsaslandırılmış, sübuta yetirilmiş, mötəbər bilik sistemidirsə, elmi biliklər xüsusi nəzəri və təcrübi tədqiqat vasitələrinin işlənib hazırlanması prosesində təşəkkül tapırsa, dinin vəzifəsi insan həyatının mənasını açıb göstərmək, təbiətin və cəmiyyətin varlığını müəyyən etməkdir. Din insan həyatının ən mühüm təzahürlərini –ailədə və məişətdə davranış qaydalarını, əxlaq normalarını, əməyə, təbiətə, cəmiyyətə, dövlətə münasibəti müəyyən edir. Din insana özünün dünya ilə vəhdətini dərk etməyə kömək edir. Dini həqiqətlər insanı, onun həyatını dəyişdirmək gücünə malikdir. Din öz dünyagörüşünü müqəddəs kitabının mətnlərində, ayin və ibadətlərində verir.



### E. Din Və Mifologiya

Din insanla bərabər var olan və yaşayan bir gerçəkdir. O, həm fərdi həm də sosial bir reallıqdır. O, hər cür elmi və fəlsəfi düşüncələrdən öncə var olmuş, insanların xoşbəxt yaşamalarına yön göstərmişdir. İnsanı yaradan Allah, onun yaradılış məqsədinə uyğun yaşaya bilməsi üçün din göndərmişdir. Ancaq din əslini qoruduğu müddətcə insanlara faydalı olmuşdur.



Dinin əsl quruluş və məqsədindən uzaqlaşmasına səbəb olan əsas faktorlardan ən önəmlisi “mif”dir. Qərbdən dilimizə keçən “mif” kəlməsi, Yunanca hekayə və nağıl mənasına gəlir. Miflər, kainatın yaradılışı, tanrılar və qəhrəmanların hekayələridir. Mifologiya isə, bütün nağıl və əfsanələri bir yerə toplayan və onları müəyyən bir tərzdə incələyən nizamdır.

Psixoloq və antropoloqların təsbitlərinə görə, insan fərq etməsə də mifoslar onun dünyasında hər zaman mövcuddur. İnsan yaradılışla əlaqəli bəzi şeyləri açıqlaya bilmədikdə bunları çox zaman miflərlə anlamaya çalışır. Başqa bir tərəfdən bəzi dini mövzular o dinin mənsubları tərəfindən mif halına gətirilə bilir. Məsələn, Qurani-Kərimdə Əshabul-Kəhf qissəsindən bəhs olunur. Lakin, qissədə yer, zaman və say ilə əlaqəli məlumat verilmir. Bu hekayələrdən təfsir kitablarında geniş bəhs edilir. Nəticədə Tərsus və Afşin kimi Əshabul-Kəhfə həsr edilən

**QEYD EDİN:**

Mif; əfsanə, dastan və hekayədən fərqlidir. Mifdə müqəddəs bir hekayə danışılır. Mövzusu gerçək hadisələrdən götürülmüş və həqiqətən baş vermişdir. Miflər olmuş hadisələri insanların qavraya biləcəyi bir dillə söyləyirlər. Sadəcə söyləyərkən məcazi bir dil və simvollardan istifadə edirlər.

(Baki Adam-Məhməd Qatar, Dinlər Tarixi, s. 23)

müqəddəs ziyarət yerləri ortaya çıxmışdır. İnsanlar bu ziyarət yerlərinə nəzir deməkdə və diləklər diləməkdədir.

Miflər dinlə bəslənir, dinlə birlikdə yaşayırlar. İnsanlar bunlardan mənəvi həzz alırlar. Dinin zəiflədiyi dövrlərdə miflər din yerinə keçmişdir və bu hər zaman dinə zərər vurmuşdur.

Son olaraq deyə bilərik ki, din və mifologiyanın həm oxşar həm də fərqli yönləri vardır. Hər bir müsəlman bunları bir-birindən ayırd edə bilməlidir. Əks tədqdirdə bilmədən dininə zərər vurmuş olar.

**Din və mifologiya arasındakı fərqləri yazın!**

Dinin qaynağı Tanrı, mifologiyanın qaynağı insandır.

.....................................................................

.....................................................................

.....................................................................

### Ə. Bir Dini Neçə Cür İzah Etmək Olar?

Göyləri, yeri və insanı yaradan Allah birdir. Ona doğru aparan yol da birdir. İnsan bu yolda Allahı tanıyır, əməlləri, davranışı və əxlaqı ilə Ona bu və ya digər dərəcədə yaxınlıq qazanır. Lakin bu yola gətirib çıxaran qollar müxtəlifdir. Bu gün dünyada bir-birindən fərqli dinlərin olması da bu müxtəlifliyin təzahürüdür.



Hər bir dinin özünün içində də onun ənənələri müxtəlif cür izah edilir, yəni bir dinin nümayəndələri ona ayrı-ayrı mövqelərdən yanaşırlar. Çox vaxt bir dində mötədil, fundamentalist, yenilikçi, islahatçı, bidətçi və mistik cərəyanları görmək mümkün olur.

Mötədil cərəyanın nümayəndələri orta mövqe tutmağa, dində bərqərar olmuş ənənələri qoruyub saxlamağa çalışırlar. Onları çox vaxt ənənəçilər də adlandırırlar.

Fundamentalistlər dində müasir təsirləri rədd edir, əsas diqqəti dinin özəyi hesab etdikləri məqamları dirçəltməyə yönəldirlər. Onlar öz dinlərinin müstəsnalığı mövqeyindən çıxış edir, başqa dinlərə qarşı dözümsüzlük göstərir, dünyəviləşməni rədd edirlər. Təməlçilər özlərini dinin əsl təmsilçiləri sayır, digər cərəyanların nümayəndələrini bidətçi adlandırırlar.

Yenilikçilər dini sərbəst, müasir ruhda izah edir, onun dövrün tələbləri ilə bir araya sığmayan hökmlərinə məcazi məna verirlər.

İslahatçılar dində islahat aparmaqla, nədənsə imtina etməklə, nəyi isə yeni ruhda izah etməklə, onu hər zaman çevik, mütəhərrik təsirli saxlamaq istəyənlərdir.

Bidətçilər dinə dindən olmayan yenilik gətirənlərdir. Dini dözümsüzlük çox vaxt bir firqənin özünü həqiqi, saf din tərəfdarları hesab edib başqalarını bidətçilikdə ittiham etməsi ilə bağlı olaraq meydan çıxmışdır.

Mistiklərin ruhani təcrübəsində zahidlik, tərki-dünyalıq meylləri üstünlük təşkil etsə də, onlar da bəzən mötədil, fundamentalist, yenilikçi, islahatçı, bidətçi mövqelərindən çıxış edə bilirlər.

**F. İlk İnsanın Dini**



Yer üzündə istənilən insan cəmiyyətini götürsək, görərik ki, onun dini olmuşdur. Ən ibtidai insanların belə ölüləri dəfn etmək üçün xüsusi yerləri olmuşdur. Halbuki insandan başqa heç bir məxluq öz ölülərini dəfn etmir. Neandertal kimi qədim insanların qəbirlərinin tapılması onların da dini olduğuna dəlalət edir.

Dinin mənşəyi haqqında iki əsas görüş mövcuddur. Birinci nöqteyi-nəzərə görə, din ilahi təbiətə malikdir, insan yaradıldığı gündən onun dini olmuşdur, bütün mədəniyyətlər gözəgörünməzliyin gerçək mövcudluğunu qəbul etmişlər. İkinci nöqteyi-nəzərə görə, maddi aləmdən başqa gerçəklik yoxdur, dini insanlar ixtira etmişlər. Əvvəlcə " ibtidai dinlər "təşəkkül tapmış, sonra isə dini təsəvvürlərin təkamülü nəticəsində mütəşəkkil təkallahlılıq dinləri yaranmışdır.

Son zamanlar isə alimlər dinin əzəldən təkallahlılıq xarakteri daşıdığını sübuta yetirməyə çalışırlar. Onlar deyirlər ki, bütün ibtidai cəmiyyətlərdə, müxtəlif şəkillərdə təsəvvür edilsə də, bir Ulu Tanrı ideyası mövcud olmuşdur.

## *ÖYRƏNDİKLƏRİMİZİ YOXLAYAQ!*

**1. Vəhy təməlli görüşə görə dinin qaynağı aşağıdakılardan hansıdır?**

A) Totem B) Mana C) Animizm D) Tanrı

**2. Din və mifologiyanı bir-birindən ayıran tərəflər nələrdir?**

**3. Dinin qaynağı haqqında darvinist görüş nədir, izah edin?**

**4. Aşağıdakı cümlələrdə boş buraxılmış qismlərə (mənəvi, dil elmi, iradə və istək, din) kəlmələrdən birini qoyun.**

Din, ağıl sahibi şüurlu insanları öz ....................... xeyirli olan şeylərə sövq edən ilahi bir qanundur.

Din, insanın içərisində olan .......... boşluğu doldura bilər.

**4. Yenilikçilər dini necə izah edirlər?**

**5. Aşağıdakı cavablar içərisində bidətçilərin kimlər olduğunu tapın?**

A. Dinə özündən olmayan yeniliklər gətirənlər.

B. Dinin mənşəyini qorumağa çalışanlar.

C. Orta mövqe tutmağa çalışanlar.

D. Müasir görüşləri rədd edənlər.

**6. Dinin mənşəyi haqqında mövcud olan iki fərqli görüşü açıqlayın?**

**7. Mif nədir? Açıqlayın.**

**8. Qısaca din nədir və niyə mövcuddur?**

**9. Fundamentalistlər dini necə izah edirlər?**

**10. Dindar və qeyri-dindar cəmiyyətlər arasındakı fərq nədir?**

**11. Dinin vəzifəsi nədir? İzah edin.**

II FƏSİL

# DİNLƏR TARİXİ VƏ QISA METODOLOGİYASI



## HAZIRLIQ TAPŞIRIQLARI

1. Dinlərin tarixi ilə əlaqəli fikir və düşüncələrinizi yazın.
2. Ölkəmizdə dinlər tarixi ilə əlaqəli hansı əsərlər vardır? Araşdırın.
3. Bir dini araşdırmaq istəsəydiniz hansı metoddan istifadə edərdiniz? Fikirlərinizi yazın.

## I. DİNLƏR TARİXİNİN TƏRİFİ, MÖVZUSU VƏ METODU

### A. Dinlər Tarixinin Tərifi

Dinlər tarixi, iki kəlmədən ibarətdir: Tarix və dinlər. Tarix özünəməxsus metodları olan ümumi sosial elmin adıdır. Geniş mənada tarix, hadisələri səbəb-nəticə əlaqəsi içərisində yer və zaman göstərərək incələyən elm sahəsidir. Din isə insanlıq tarixində xüsusi yeri olan məfhumdur. İnsan həyatında xüsusi yeri olan dinlər ilə maraqlanan tarix sahəsinə də Dinlər tarixi deyilir.

Dinlər tarixi tarix boyunca var olmuş bütün dinləri ayrı seçkilik etmədən araşdıran elm sahəsidir. Bu yönüylə dinlər tarixi, heç bir dini müdafiə etmir, bütün dinlərə eyni gözlə baxır.

Dinlər tarixi günümüzdə mənsubu olan və ya olmayan bütün dinlərin tarixini, inanc, ibadət və əxlaq sistemlərini və dini qurumlarını tərəf tutmadan araşdıran elm sahəsidir.



### B. Dinlər Tarixinin Mövzusu

Hər bir elmin müəyyən bir mövzusu vardır. Dinlər tarixinin mövzusu da yer üzündə var olmuş bütün dinlərdir. Həmçinin tarixdə uzun zaman yaşamış və daha sonra müxtəlif səbəblərlə yox olmuş dinlər də daxil olmaqla bu gun yer üzündə varlığını davam etdirən bütün dinləri incələməyi hədəfləyir. Bu araşdırmada dinlərin ortaya çıxmalarını, inkişaf etmələrini, bir-biriylə olan münasibətlərini, inanc, ibadət və əxlaq sistemlərini və məzhəblərini ələ alır.

### C. Dinlər Tarixinin Metodu

Dinlər tarixinin təməl metodu, tarixi qarşılaşdırmalı metoddur. Bu yönünə görə dinlər tarixinə “qarşılaşdırmalı dinlər tarixi” də deyilir. Dinlər tarixi dinlərin ortaya çıxışı, inkişaf etməsi və yox olması kimi mövzularda tarix metodundan istifadə edir. Dinlər tarixi istifadə edəcəyi materialı daim tarixdən, yaşanan, təcrübə edilən həyatdan alır. Bu metodu zaman-zaman qarşılaşdırma metodu ilə bərabər həyata keçirir. Buna görə də buna qarşılaşdırmalı tarix metodu adı verilmişdir.

Dinlər tarixi dinləri incələyərkən həmçinin “fenomenoloji” və “hermonetik” metodlardan da istifadə edir. Tarixi qarşılaşdırmalı metodla toplayıb ortaya çıxardığı materialları fenomenolojik metod vasitəsiylə təsnif edib, sinifləndirir. Sonra isə hermonetik metoda baş vuraraq bu dini materialları anlayıb yorumlamağa çalışır. Dinlər tarixi bu prosesləri həyata keçirərkən başqa elmlərin metodlarından da istifadə edir. Filiologiya, antropologiya, sosiologiya və psixologiya elmlərinin metodlarından istifadə edir. Xüsusilə filologi-

ya, dini mətnlərin analiz edilməsi, mənalandırılması və siniflǝndirilməsində dinlər tarixinə əhəmiyyətli dərəcədə kömək edir.

## D. Dinlər Tarixinin Digər Elm Sahələri Arasındakı Yeri

Dinləri obyektiv olaraq, yəni ayrı-seçkilik etmədən incələyən elm sahələrindən təşkil olunan qrupa "Din Elmləri" deyilir. Din elmləri yer üzündə var olan bütün dinləri, ortaya çıxmasından yox olmasına qədər hər tərəfli incələyir. Həmçinin dini dəyərlər, dini təcrübələr, dinlərin kökləri və qaynaqları, dinlərin inkişaf etməsində və zəifləməsində rol oynayan faktorlar, din ilə elm, ədəbiyyat, fəlsəfə, siyasət və əxlaq arasındakı münasibətlər, dinlər arası qarşılıqlı təsirlər Din elmlərinin incələmə sahəsinə daxildir.

Bütün bu yönləriylə dinlər tarixinin, din sosiologiyası, din psixologiyası, din fəlsəfəsi kimi elm sahələri ilə yaxından əlaqəsi vardır.

Dinlər tarixi, yuxarıda məlumat verdiyimiz kimi, dinlərin ortaya çıxışını, inkişaf etməsini, ibadət və əxlaq sistemi kimi mövzuları incələyən elmdir.

Din sosiologiyası, din ilə cəmiyyət arasındakı əlaqələri və bu əlaqə nəticəsində ortaya çıxan prosesləri, dini qrupları incələyir

Din psixologiyası, dinin fərd üzərindəki təsirlərini incələyir.

Din fəlsəfəsi isə, başda tanrı inancı olmaqla dini inanc və hökmlərin məntiqini və keçərli olub-olmadığını incələyir.



## E. Dinlər Tarixi İlə Əlaqəli Yazılan Əsərlər

Dinlər Tarixi bir elm sahəsi olaraq ilk dəfə qərbdə inkişaf etmişdir. Amma dinlər tarixi mövzusunda tarixin ilk dönəmlərində şərqdə də əsərlər qələmə alınmaya başlamışdır.

1. İslam aləmində qələmə alınan dinlər tarixi ilə əlaqəli əsərlər.
2. Delhili Rahmətullah Əfəndi, İzharul-Haqq əsəri, İstanbul, 1886.
3. Əbu Bəkir Əhməd əş-Şəhristani, Əl-miləl van-nihəl əsəri, Qahirə, 1976.
4. Prof. Dr. Əhməd Çələbi, Muqanətul-Ədyan əsəri, Qahirə, 1910.
5. Məhəmməd Əbu Zəhra, Muhadərat fin-Nəsraniyyə əsəri, Qahirə, 1966.

**Qərbdə qələmə alınan dinlər tarixi əsərləri**

1. Rudolf Otto, Müqəddəs əsəri, Paris, 1949.
2. Mircea Eliade, İnsanlığın İnanc Tarixi əsəri, Paris, 1983.
3. Emile Durkheym, Dini Həyatın İbtidai Şəkilləri əsəri, Paris, 1912.
4. Gustav Menching, Dünya Dinləri əsəri, Almaniya, 1938.

**Türkiyədə qələmə alınan dinlər tarixi əsərləri**

1. Əbdürrəhman Küçük, Günay Tümər, Dinlər Tarixi əsəri, Ankara, 2002.
2. Məhməd Aydın, Dinlər Tarixinə Giriş əsəri, Konya, 2015.
3. Məhməd Aydın, Ensiklopedik Dinlər Lüğəti, Konya, 2015.
4. Əkrəm Sarıqçıoğlu, Başlanğıcdan Günümüzə Dinlər Tarixi əsəri, İsparta, 2011.
5. Annemarie Şimmel, Dinlər Tarixinə Giriş əsəri, Ankara, 1999.

## ÖYRƏNDİKLƏRİMİZİ YOXLAYAQ!

**1. Aşağıda boş buraxılmış yerə uyğun gələn ifadəni yerləşdirin.**

Dinləri obyektiv olaraq, yəni ayrı-seçkilik etmədən incələyən elm sahələrindən təşkil olunan qrupa ................... deyilir.

**2. Aşağıda verilmiş cavablarda hansı dinlər tarixinin metodu deyildir?**

a. Qarşılaşdırma
b. Fenomenolojik
c. Sual-cavab
d. Hermonetik

**3. Dinlər Tarixinin mövzusu nədir? Yazın.**

..........................................................................................................................
..........................................................................................................................

**4. Dinlər Tarixi hansı dinləri əhatə edir?**

a. Yaşayan dinləri
b. Mənsubu olan dinləri
c. Yaşayan, yaşamayan tarixdə mövcud olan bütün dinləri
d. Dünya dinləri

**5. Başa düşdüyünüz kimi dinlər tarixinin tərifini yazın.**

..........................................................................................................................
..........................................................................................................................

**6. Aşağıdakı əsərlərdən hansı İslam aləmində qələmə alınan dinlər tarixi ilə əlaqəli əsər deyildir?**

a. Emile Durkheym, Dini Həyatın İbtidai Şəkilləri əsəri, Paris, 1912.
b. Məhəmməd Əbu Zəhra, Muhadərat fin-Nəsraniyyə əsəri, Qahirə, 1966.
c. Əbdürrəhman Küçük, Günay Tümər, Dinlər Tarxi əsəri, Ankara, 2002.

# III FƏSİL

# DİNLƏRİN TƏSNİFİ



## HAZIRLIQ TAPŞIRIQLARI

1. Ən qədim ibtidai dinlər haqqında məlumat toplayın.
2. İslam dininin inanc sisteminin Xristianlıq və Yəhudiliklə fərqləri haqqında araşdırma aparın.
3. Yaşadığınız bölgədə İslam dini xaricində digər dinlərə mənsub məbədlər varsa bu məbədlər barədə bir yazı yazın.
4. Qurani-Kərimdə Yəhudilik və Xristianlıq ilə əlaqəli ayələrdən misallar gətirin və bu ayələr barəsində düşünün.

## I. DİNLƏRİN TƏSNİFİ

Dinlər müxtəlif yönlərinə görə fərqli təsnifata tabe tutulur. Dinlə əlaqəli təsniflərdə dinin özündən yola çıxaraq edilən təsniflərlə, təsnifi edən şəxsin dinə yönəlik fikirlərinin təsirli olduğu görülməkdədir. Misal üçün keçən əsrdə dinlər, "qədim dinlər" və "inkişaf etmiş dinlər" olaraq təsnif olunmuşdur. Digər tərəfdən dinin özündən yola çıxaraq edilən təsniflərdə hər din mənsubu öz inanc və dəyərlərini mərkəzə qoyaraq dinləri təsnif etməyə çalışmışdır. Bu zaman da "haqq dinlər" və "batil dinlər" şəklində din təsnifatı ortaya çıxmışdır.

**QEYD EDİN:**

Alimlər ilahi dinlərə "miləl dinlər", batil dinlərə isə "nihal dinlər" adını vermişlər.

Biz burada mövzunu çox uzatmadan dinlərin təsnifatı ilə əlaqəli qısa bilgilər verəcəyik.

Dinlər yayılma şəkillərinə görə ümumbəşəri və milli dinlərə bölünür. Sahib olduğu inancları dünya miqyasında, yəni bütün insanlar arasında yaymağa çalışan dinlərə ümumbəşəri dinlər deyilir. Dinin əhatəsini yalnız bir millət və ya qəbilə arasında saxlamağa çalışan dinlərə isə milli dinlər deyilir.

Dinlər inanılan tanrının təkliyi və çoxluğu yönündən aşağıdakı qruplara bölünür:

1. Monoteist dinlər
2. Dualist dinlər
3. Henoteist dinlər
4. Politeist dinlər

Tək allaha inanan dinlərə "monoteist dinlər" deyilir . Dini inancında bir-birinə zidd iki tanrı olan dinlərə "dualist dinlər" deyilir. Bir tanrıya inanmaqla yanaşı digər tanrıların varlığını da qəbul edən dinlərə "henoteist dinlər" deyilir. Birdən çox tanrıya inanan dinlərə də "politeist dinlər" deyilir.

Yayıldıqları coğrafiyaya görə dinlər; Asya dinləri, Afrika dinləri, Avropa dinləri, Hind dinləri, Çin və Yapon dinləri kimi qruplara bölünür.

Bir də "senkretik dinlər" adlı bir din anlayışı vardır ki, bu dinlər də müharibələr, sürgünlər və başqa səbəblərə görə fərqli dini inancların məcburiyyət qarşısında bir yerdə yaşamaları nəticəsində ortaya çıxan dinlərdir. Misal üçün Sihizm dini, İslam və Hind inanclarının bir çox ünsürlərini özündə cəm edən senkretik bir dindir.

## II. ƏN QƏDİM İBTİDAİ QƏBİLƏLƏRDƏ DİN ANLAYIŞI



Qədim qəbilələr, inkişaf etmiş həyat tərzi olmayan, gündəlik keçimini ovçuluq və balıqçılıqla təmin edən qəbilələrdir. Bu gün Afrika, Avstraliya və Braziliya kimi bəzi ölkələrdə yaşayan belə qəbilələr mövcuddur. Bu qəbilələrin ümumi sayı yer kürəsi əhalisinin 5%-ni təşkil edir.

Qərbdə uzun zaman bu qəbilələrin insan olub-olmadığı mübahisə olunmuşdur. Kilsə əvvəlcə onların insan olmadıqlarını müdafiə etsə də, sonralar Papa II Paul Amerikada yaşayan qədim qəbilələrin Adəmdən gəldiyini elan etmişdir.

Hal-hazırda yer üzündə mövcud olan qədim qəbilələrin bəziləri öz inanc və adət-ənənələrini qoruyub saxlamış, bəzi qəbilələr isə başqa inanc sistemlərini mənimsəmişlər.

### A. Ən Qədim İbtidai Qəbilə Dinlərinin Özəllikləri

Ən qədim ibtidai dinlərin aşağıdakı özəllikləri vardır:

1. Ən qədim ibtidai dinlər bir qəbiləyə məxsusdur və o qəbilənin adı ilə tanınır.
2. Bu dinlər məhəlli dinlərdir. Yəni bu dinlərdən milli dinlər törəməmişdir.
3. Bu dinlərin müqəddəs kitabları və yazılı mətnləri yoxdur.
4. Ən qədim ibtidai dinlərdə hər qəbilə Tanrını öz qəbilə dilində və özünəməxsus bir şəkildə adlandırırdı. Hər qəbilənin Tanrısının xüsusiyyətləri digər qəbilənin Tanrısının xüsusiyyətlərindən fərqlənirdi.
5. Qədim ibtidai qəbilələrdə bir dini seçən şəxs başqa bir dini seçə bilməzdi.
6. Ən qədim ibtidai dinlərdə sehrə və sehrbazlığa böyük önəm verilir.
7. Ən qədim ibtidai dinlərdə ruhun müxtəlif şəkillərdə yaşadığına inanılır, bununla yanaşı axirətlə əlaqəli görüşləri açıq deyil.



## III. QƏDİM İNANC ŞƏKİLLƏRİ

### A. Bütpərəstlik



Ən qədim qəbilələrdə çox yayılmış dini inanc şəkillərindən biri bütpərəstlikdir. Dini inancın bu formasında insanlar öz əlləri ilə daşdan, odundan və hətta yemək vasitələrindən hazırladıqları bütlərə iman edir, onlar önündə qurbanlar kəsir, yedikləri yeməklərdən onlara da təqdim edir və ən əsası onlara dua edir, dilək diləyir, qarşısında səcdə edirlər. Qədim ərəblər, İslam dinindən öncə aralarında çox yayılmış olan bu inanc şəklini Allaha yaxınlaşmaq üçün bir vasitə olduğu şəklində izah etmişlər.

**B. Animizm**



Bu ad ruh mənasına gələn latın sözü “anima”dan törəmişdir. Ruhların mövcudluğuna, heyvanların, bitkilərin, cansız cismlərin, təbiət qüvvələrinin -günəşin, ayın ruhu və ağlı olduğuna və onların fövqəltəbii qüvvəyə malik olduğuna etiqad animizm adlanır.

Animistlərə görə, dağın da ruhu vardır və dağa qalxmaq istəyən kəs ondan icazə almalıdır. Ağacı kəsmədən öncə ondan üzr istənilməlidir.

Qərbi Afrikada bəzi animist qəbilələrin min yeddi yüz tanrısı vardır. Animistlər müqəddəsləşdirdikləri təbiət hadisələrinə və cismlərə ehtiramla yanaşır, onlara qurbanlar kəsir, onların şərəfinə müxtəlif ayinlər keçirirlər.

**C. Magiya**



Qədim inanc şəkillərindən biri də magiyadır. Onun 20-30 min il tarixi vardır. Magiya sehrbazlıq, ovsunçuluq, cadugərlik kimi izah edilə bilər. Magiya çox vaxt dua yazmaq və oxumaqla, müəyyən rəqslər ifa etməklə təbiət hadisələrinə, yaxud insana təsir göstərməyi nəzərdə tutur: Məsələn: yağış yağması üçün ovsunçu su çuxurunun ətrafında müəyyən rəqslər ifa edir, su quşlarının qışqırtısını xatırladan səslər çıxarır, yaxud yerə ağac basdırır, sanki göyləri başa salmaq istəyir ki, yağış yağsa, gölməçələr əmələ gələr, ağaclar susuz qalmaz.

**QEYD EDİN:**
Sehr, bir maddənin və ya əşyanın gerçək, öz sifətiylə deyil başqa sifətlərlə göstərilməsidir.

Magiyada ayin predmetləri xüsusi əhəmiyyət daşıyır; məsələn: belə hesab olunur ki, maralın dərisini deşmək maral ovunda kömək edir. Heyvanın hər hansı bir hissəsini xatırladan daş və ya ağac parçası ona sehrli təsir göstərmək üçün münasib sayılır. Bəzi ayin predmetləri böyük gücə malikdir. Heyvanlarla bağlı xüsusi tilsim və daşlarda güc vardır. Canavar və ya ayı dərisindən biçilmiş geyim onların ruhi enerjisinin insana keçməsinə kömək edir.

**D. Totemizm**



Totemizm tayfanın ata-babaların, sitayiş etdiyi şey mənasını daşıyan “totem” sözündən gəlir; bir soya, tayfaya mənsub adamlarla bir heyvan və ya bitki növü, bəzən də hansısa bir təbiət hadisəsi və ya predmeti arasında fövqəltəbii əlaqə və ya qan qohumluğu olduğu inancdır.

Totemistlər inanırlar ki, onların əcdadları özlərində həm insan, həm də tayfa toteminin əlamətlərini birləşdirən yarım adam – yarım heyvan, yarım adam – yarım bitki, fantastik varlıqlar olmuşlar.

Soy öz toteminin adı ilə tanınır, totemə etiqadla bağlı davranış normalarına və adətlərə soyun hər bir üzvü əməl etməlidir. Sosial münasibətlər də bu təməl üzərində tənzim edilir.

Ən mötəbər əcdadlar öldükdən sonra tədricən totemə çevrilir, onların fövqəltəbii imkanlara malik olduqlarına etiqad yaranır.

**E. Fetişizm.**

Fetiş, kəlmə olaraq "hazırlanmış" deməkdir. Cansız cismlər, qeyri-adi formalı daşlar, qayalar, ağaclar, gildən düzəldilmiş bütlər və insanabənzər təsvirlərdə qeyri-adi təbiətüstü gücün olduğuna inanc fetişizm adlanır. İnsanlar hansısa bir cismi fetişləşdirir -onu bütə çevirir, geyindirir, bəzəyir və onun şərəfinə qurbanlar kəsirdilər. İslamdan qabaq ərəblər gümüşdən, misdən düzəldilmiş bütlərə sitayiş etmişlər. Hər bir şey fetiş ola bilər ancaq fetiş olan əşya və yaxud cisim (dəmirin möhkəmlik xüsusiyyəti) kimi xüsusiyyət daşımalıdır. Qvineyada bir şəxsi fetiş muzeyində 20 min fetiş saxlanılır.

**BİLİRDİNİZMİ?**

Dua mahiyyətli boyunbağılar, tilsimlər və uğur gətirdiyi qəbul edilən əşyaların fetişizmdən qaldığı söylənilir.

Qədim Azərbaycan ərazisində qayalara, ağaclara pərəstiş kimi fetişizm formaları olmuşdur.



**Ə. Şamanizm**



Şaman -sehrlə məşğul olan, türkəçarə deməkdir. Şamanın vəcd halında cuşa gələrək ruhlarla əlaqəyə girməsinə şamanizm deyilir. Bu etiqada görə, insanların başına gələn xəstəliklərin, uğursuzluqların səbəbi şər ruhlardır. Şaman vəcd halında cuşa gələrək ruhlar aləminə girə bilir, xeyir ruhların köməyilə oradakı şər ruhları qovur və nəticədə xəstə sağalır, uğursuz adam uğur qazanır.

Şamanizm varislik yoluyla keçir, ancaq xüsusi vergi kimi də gələ bilər. Şaman olmaq üçün daxilən pak olmaq və hər cür məşəqqətlərə dözməyi bacarmaq lazımdır. Şamanlar xüsusi təlimlər keçir, ruhların adlarını, daşıdığı vəzifələri öyrənirlər.

Şamanizm İslamdan qabaq bəzi türk qəbilələri arasında geniş yayılmışdır. Şamanizm inanc sistemi şəklinə görə bir din olaraq qəbul edilməsə də, din qədər təsiri olmuş, uzun illər türklərin həyat və yaşayışlarında böyük rol oynamışdır. Xüsusilə Altay türkləri uzun illər şamanizmin təsirində

**QEYD EDİN:**

Şamanların işlətdiyi xüsusi mərasim avadanlığı; dəf, çax-çax, xüsusi baş örtüyü, əba və kəmərdir.

qalmışdır. Cəmiyyət arasında böyük güc olan hətta yayıldığı bölgələrdə dövlətin qədərini belə dəyişdirə bilən şamanizm inancında olan türklərdə də digər eyni inanca sahib olan millətlərdə olduğu kimi, şamanların xəstələri bitki mənşəli dərmanlardan istifadə edərək müalicə etdiyi inancı vardır.

Şamanizm inancına görə, insanların biri özlərində digəri başqasında olmaqla birbirinə oxşar iki ruhu vardır. Bu ruhlardan biri hətta heyvanda da ola bilər.

Şamanizmdə beş şey müqəddəs sayılır. Bunlar -dəmir, torpaq, od, su və ağacdır.

Şamanizm, Sibrin aborigen xalqlarının dini olmuşdur. Bu gün tuvalılar, buryatlar, yakutlar, mansilər, xakaslar, şorlar, nenlər və başqa xalqlar arasında geniş yayılmışdır.

## IV. HİND DİNLƏRİ

Hind yarımadasında ortaya çıxmış və yayılmış dinlərə hind dinləri deyilir. Bunlar fəlsəfəcə ümumi olaraq bir-birinə bənzəsə də tarixi inkişafı və ya qurucuları yönündən özlərinə məxsus özəllikləri vardır. Bu dinlər aşağıdakılardır:




### A. Hinduizm



Hinduizm e.ə. II-I minilliklərin qovşağında Qədim Hindistanda yaranmışdır.

Hinduizm qavramını daha çox avropalılar işlədir. Hindular öz dinini “Sanatana Dharma” (əzəli və əbədi şəriət) və ya sadəcə “dharm” adı ilə ifadə edirlər. Bu dini digər dinlərdən ayıran önəmli özəlliyi bu dinin müəyyən bir qurucusunun və iman təqririnin olmamasıdır.

Bu dinin ardıcılları, əsasən Hindistan, Banqladeş, Nepal, Pakistan və Şri-Lankada yaşayırlar. Hinduizmin əsasları “veda”lar adlı ədəbi parçalarda, “Ramayana” “Mahabharata” adlı dastan kitablarında və s. mənbələrdə toplanmışdır. Bu dini mətnlərin bəziləri himn, bəziləri nəğmə, bəziləri isə dua və tilsim məzmunludur.



Hinduizm bəlkə də bütün dinlər içində ən çox tanrılı dindir. Hinduizmdə müqəddəs sayılan tanrıların ümumi sayı 333 milyondur. Bu tanrıların bəziləri bir-biri ilə ziddiyət təşkil edərək, daim mübarizədədirlər.

Hinduizmdə üç tanrı əsas sayılır: Brahma, Şiva və Vişnu. Brahma bütün başqa tanrıların atası, bütün müsbət və mənfi qüvvələrin yaradıcısıdır. O, taleləri müəyyən edir, istəkləri yerinə yetirir. O biri iki tanrı dünyanı idarə etməkdə onlara kömək edirlər. Şiva pis əməllərə görə cəza verir, Vişnu isə yaxşı əməlləri mükafatlandırır.

Hinduizm təliminə görə, cəmiyyət ciddi şəkildə təbəqələrə bölünür; bu təbəqələrə “kast” deyilir. 4 kast təbəqəsi vardır. “Brahmin” (din adamı), “kşatriya” (idarəçi və əsgərlər), “vaisya” (ticarətçi, kəndli), “sudra” (xidmətçi). Həmçinin bunların xaricində mənsub olduğu kastın şərtlərinə itaət etməyərək kast xaricinə qovulmuş daha bir sinif vardır ki, bunlara “puryalar” (toxunulmazlar) deyilir. Hər bir kastaya məxsus insanların həyatda izləməli olduqları işlər bir-birindən fərqlənir. Əgər insan aşağı kastaya mənsubdursa, onun məqsədi yalnız təsərrüfat işləriylə məşğul olmaq, sakit həyat tərzi yaşamaqdır. Əgər insan döyüşçü təbəqəsindəndirsə o, şücaətlər göstərməli, dünyəvi hakimiyyətə can atmalıdır. Ruhani (brahman) kastasına mənsub olanların vəzifəsi isə ibadət və zahidlikdir. Hindulara görə kast sistemi dini bir inancdır.

Hinduizm insanda mütilik, dünyaya biganəlik, zahidlik əhval-ruhiyyəsi yaradır, onun imkan və istedadlarını hansı ictimai təbəqəyə aid olması ilə məhdudlaşdırır.

Hinduizmə görə, insan ruhu bir bədəndən başqa bir bədənə keçə bilir. Bu inanca “reankarnasyon” və ya “tənasüx” inancı deyilir. Bu inanca görə, insan ömrünü başa vurduqdan sonra etdiyi əməllərin dərəcəsindən asılı olaraq, onun ruhu ya daha üstün, ya da daha aşağı səviyyəli başqa bir bədənə daxil olur və öz həyatını davam etdirir. Beləliklə, hinduizmə görə ruh dəfələrlə müxtəlif bədənlərdə yaşaya bilər.

Hindular sabah günəş çıxmadan, günorta və bir də axşam olmaqla gündə 3 dəfə dua etməklə ibadət edirlər. Hindistan dövlətinin tanıdığı ildə 16 rəsmi bayramları vardır.

### B.Sihizm



Sihizm, Hindistanın şimalında XV əsrdə ortaya çıxmışdır. Özündə islamla hinduizmin xüsuiyyətlərini birləşdirir. ”Sih” sözü “şagird”, ”mürid”, ”həqiqət axtaran” mənalarını daşıyır. Sihlər Allahın birliyini qəbul edir, bütlərə sitayişi rədd edirlər, insanların Allah qarşısında bərabər olduğuna inanırlar.

Sihizmin banisi “Quru Nanak” sayılır. Rəvayətə görə Nanak 30 yaşındaykən bir dəfə paklanmaq üçün çaya girmiş və üç gün suyun altında qalmışdır. Sudan çıxdıqdan sonra Allahla görüşdüyünü, qaranlıq zəmanənin günahlarını yumaq üçün dünyaya qayıtdığını söyləmişdir. Nanakın təlimində həm hinduizmin həm də İslamın təsirləri hiss olunur. Nanak təliminə görə insanın

məscidi mərhəmət, namaz xalçası sədaqət, Quranı salehlik, orucu yaxşılıq olmalıdır. O, öz ardıcıllarına yaxşı əməlləri özlərinə kəbə etmələrini təlqin edirdi.

Sihizm insanda iki əsas fəziləti mühüm hesab edir: itaətkarlıq və ibadətkarlıq. Sihlərə görə, Allah birdir, bütün dünya başqa-başqa adlar altında həmin bir olan Allaha ibadət edir. Sihlər Allahı “Sat” (Haqq) adlandırırlar.

Etiqadlarında daha möhkəm olan sihlər “Xalis” (saf) məqamına yetişirlər. Lakin bu mərtəbəyə yüksəlmək üçün qoyulan xüsusi meyarlar o dərəcədə yüksəkdir ki, çox az adam xalis məqamına yetişə bilir. Sihizmdə spirtli içkilər, siqaret və asılılıq yaradan maddələr qəbul etmək haram sayılır.

Sihlər səhər günəş doğmadan öncə ibadət olaraq təfəkkür və dua edərlər. Sih inancında digər dinlərdə olduğu kimi həcc, oruc və qurban kimi ibadətlər yoxdur.

Bugün sihizm Hindistanda müstəqil din kimi mövcuddur. Ölkədə 14 milyon sih yaşayır. Sihizmin mərkəzi Pəncab sayılır və sihlər müstəqil Xalistan Sih dövləti yaratmaq uğrunda mübarizə aparırlar.

### C. Caynizm



E. ə. VI əsrdə Hind yarımadasının şimalında, Bihar əyalətində Hinduizm dininin kast anlayışına və qanlı qurban mərasimlərinə qarşı bir inanc olaraq ortaya çıxmışdır. Bu gün mənsublarının hamısını Hindistanda yaşadığı dünyanın ən az tərəfdarı olan dinlərindən biridir. Caynizm buddizmə yaxın oxşarlığı səbəbiylə çox zaman onun bir qolu və ya versiyası kimi görülmüşdür.

Caynistlər dünyadakı canlı-cansız hər varlığın bir ruha sahib olduğu prinsipindən yola çıxaraq, hər cür varlığa zərər verməyi qadağan edən “ahımsa” prinsipinə qatı şəkildə inanırlar. Hətta keçəcəyi yolda görünməyən bir canlını əzməmək üçün öncədən yolu süpürər sonra keçərlər. Caynizmdə də digər hind dinlərində olduğu kimi ruhun bir bədəndən digərinə keçmə əqidəsi mövcuddur.

Mövcud qaynaqlara görə caynizmin qurucusu Vardhamanadır. O, təxminən e. ə. 540-cı ildə Hindistanın Bihar əyalətində dünyaya gəlmiş və kşatriya (əsgər, idarəçi) kastına mənsub olmuşdur.

Caynizmə görə dünyanın nə əvvəli nə də axırı var. O, əbədi olaraq uzun yüksəliş və tənəzzül dövrləri keçir. Tənəzzül dövründə insanlar rəhbərliyə ehtiyac duyarlar, işləri tamamilə pisləşəndə tirtkankaralar zühur edir. Hazırda insanlar tənəzzül dövrəsinin beşinci mərhələsindədirlər. Bu mərhələ caynizmin baş təbliğçisi Mahaviranın ölümündən üç il sonra başlamışdır və 21 min il çəkəcəkdir.

Caynizmə görə, qurtuluş üçün mokşa halına nail olmaq -yəni ruhu materiyadan azad etmək lazmdır. Bunun üçün isə üç şey əsasdır:

1. Həqiqi iman (caynizmin düzgün yol göstərdiyinə etiqad)
2. Kamil bilik (caynizmin hökm və prinsiplərini bilmək)
3. Saleh həyat

Hal-hazırda Hindistanda caynizmə etiqad edənlərin sayı 3 milyondan çox deyildir. Caynizm əsasən zəngin və elitar təbəqə arasında yayılmış bir dindir.

**QARŞILAŞDIRIN!**

Caynizmdə əxlaqi qanunlar 5 başlıq altında tolanır:

1. Öldürməmək
2. Yalan söyləməmək.
3. Heç bir şəkildə oğurluq etməmək.
4. Mümkün olduğu qədər cinsi münasibətdən uzaq durmaq.
5. Yalnız ehtiya olan qədər malla yetinməyi bilmək.
6. Caynizmin başqa dinlərlə əxlaqi qanunlarını qarşılaşdırın.

## Ç. Buddizm




Buddizm banisi e. ə. VI əsrdə yaşamış Cənubi Nepal dövlətlərindən birinin şəhzadəsi “Qautama” olmuşdur. Rəvayətlərə görə, Qautama gənclik dövründə təmtəraqlı şəhzadə ömrü sürmüş, amma günlərin birində küçədə kasıb və xəstə şəxsləri görərək, dünyanı anlamağa başlamışdır. Bundan sonra o, saraydan qaçıb sərgərdan həyata başlamış, günlərlə dərin düşüncələrdən sonra həqiqətlər ona açılmışdır. O vaxtdan Qautama “Budda” (yəni nurlu) ləqəbini daşımağa başlamışdır. Budda bütün ömrü boyu gəzib dolaşaraq öz təlimlərini yaymışdır. Buddanın ölümündən sonra şagirdləri onun yolunu davam etdirmişlər. Budda ilk dövrlərdə mənəvi yenilənməyə rəhbərlik edən bir insan olaraq tanınırdı. Ama zaman keçdikcə Budda duyğular dünyasından uzaq təsəvvür edilməz bir varlıq olaraq tanınmaya başladı.

**QEYD EDİN:**

Nirvana termini, kəlimə olaraq sükunət, azadlıq və ən böyük xoşbəxtlik mənasına gəlir. Termin olaraq isə hər cür acı və kədərdən qurtulub azadlığa qovuşmaq deməkdir.

Buddizmin əsasını nəfsani istəklərdən uzaqlaşmaq və ruhi kamilliyə çatmaq təşkil edir; ruhi kamilliyin son mərhələsi “nirvana” adlanır. Nirvana mərhələsində bütün nəfsani istəklər yox olur. Nirvana mərhələsinə daxil olmuş şəxs buddaya çevrilir.

Buddizmdə də ruhun bir bədəndən başqa bədənə keçməsinə və keçmiş həyatın nəticələrinə görə, ruha üstün yaxud aşağı bədəndə həyat verilməsinə inam mövcuddur.

Buddizm də caynizm və sihizm kimi hinduizmdəki kast anlayışına qarşı çıxaraq meydana gələn bir inanc sistemidir.

Buddizm müqəddəs mətnlərinə "Pali kanon" deyilir. Bunlara həmçinin "tripitaka" da deyilir. Tripitaka 3 səbət mənasına gəlir.

Buddizmdə iki məzhəb vardır. Hinayana və Mahayana budizmi. Hinayana məzhəbi mənsubları isə özlərini "therovada" yəni atalarının inancına sadiq qalanlar adlandırırlar.

Buddizm inancına görə həyata aludə olmaqla, özümüzü samsara adlanan dünya okeanına, acı-iztirab dəryasına atmış olarıq. Bütün bu sıxıntılardan qurtarılmanın yolu hər cür dünyəvi arzudan uzaq olmaqdır.

Buddizmə görə, insanın qədəri tanrı tərəfindən deyil, öz iradəsi daxilində həyata keçirdiyi işlərlə təyin olunur.

Buddizmdə ibadətin mərkəzi Buddadır. İbadət sadəcə müəyyən bir şəkildə edilmir. Bir buddistin gündəlik həyatında bütün fəaliyyətləri ibadət sayılır. Amma müəyyən edilmiş ibadət zamanları və məkanları da mövcuddur. Buddizmdə ibadət məkanı "vihara" adlanır. Xalq ayda iki dəfə ayın hilal və dolunay günlərində viharaya gedərlər. Buddizmdə camaatla ibadət məcburi deyildir. Buddistlər dua edərkən "mala" adlanan dua təsbehlərindən (108 dənə) və "çakra" adlanan dua təkərindən istifadə edirlər.

## V. ATƏŞPƏRƏSTLİK DİNİ: ZƏRDÜŞTLÜK

Zərdüştlük, qədim İran kökənli dini bir inancdır. Bu dinə "Məcusilik" də deyilir. Bu ad qədim İran gələnəyində mövcud olan bir toplulluluğu ifadə edən "Məcuş"dan gəlməkdədir. Bu dinin qurucusu təxminən e. ə. VI əsrdə yaşamış "Zərdüşt" adlı şəxs olmuşdur. Zərdüşt "gözəl dəvələrə sahib olan" mənasına gəlir. Avesta və Yunan mənbələrinə görə Zərdüşt, Cənubi İranda Kral Viştaspanın zamanında yaşamışdır. Zərdüştlüyün müqəddəs kitabı "Avesta"dır. "Avesta" bir neçə hissədən ibarətdir. Onun ən qədim hissəsini təşkil edən "qatha" (ilahilər) adlı fəsillər Zərdüştün dövründə tərtib edilmişdir.

**QEYD EDİN:**

Zərdüşt, Zarathustranın Yunanca qarşılığıdır. Zarath- gözəl, doğru; ustra- dəvələr deməkdir. Yəni gözəl dəvələrə sahib olan deməkdir.

Zərdüştlük təliminə görə bütün dünyaya iki zidd qüvvə hökm edir. Bunlar xeyir və şər qüvvələridir. Xeyir tərəfi "Ahura" adlı mələyə bənzər varlıqlar, şər tərəfi isə "div" adlı varlıqlar təmsil edir. Ahuralara "Ahura – mazda" (Hörmüzd) adlı xeyir tanrısı, divlərə isə "Anqra – manyu" (Əhrimən) adlı şər tanrısı başçılıq edir. Bu iki qüvvə həmişə bir-biri ilə mübarizə aparır.



Zərdüştlüyə görə, hər insanın qəlbində xeyir yaxud şər tanrısı öz hakimiyyətini qura bilər. İnsan öz qəlbindən yaxşı niyyətlər keçirməyə, xeyirli sözlər söyləyib, müsbət hərəkətlər etməyə çalışmalıdır ki, öz qəlbində Hörmüzdün hakimiyyətini gücləndirsin, Əhrimənin



hakimiyyətini isə zəiflətsin. Zərdüştlükdə Əhrimən bütün pisliklərin banisi hesab edilir. O, günahları, cadügərliyi, ölümü, xəstəlikləri, qocalığı, zəhərli həşəratları yaratmış, hər cür pislik etmişdir. Zərdüştlük təliminə görə, od xeyir qüvvələrin rəmzi hesab olunur. Buna görə də, Zərdüştlükdə alov müqəddəsdir və ibadət obyekti sayılır.

Zərdüştiliyin bəzi qolları Hörmüzd və Əhriməni, onlardan daha güclü olan “Zirvan” adlı baş Allahın övladları sayır. Zirvan zamanın və taleyin hakimidir. Xeyir və şər qüvvələr arasındakı mübarizənin gedişi və taleyi Zirvan tərəfindən qabaqcadan təyin edilmişdir.

Bəzi alimlər Zərdüştü peyğəmbər, zərdüştlüyü də sonradan təhrif edilmiş ilahi din sayırlar. Onların fikrincə, Zərdüşt Allah tərəfindən aldığı “Avesta”nı öz ümmətinə öyrətmiş, insanları doğru yola səsləmişdir. Lakin başqa dinlər kimi, Zərdüştlük də sonradan təhrif edilmişdir. “Avesta” başdan sona dəyişdirilmiş, hətta bütün ilahi dinlərin əsasını təşkil edən monoteist (təkallahlılıq) əqidəsi zərdüştlükdən tamamilə çıxarılaraq, ikiallahlılıqla əvəz edilmişdir. Bu fikrin sübutu kimi demək olar ki, zərdüştiliyin bəzi təlimləri ilahi dinlərin ruhu ilə üst-üstə düşür. Məsələn, zərdüştlükdə də axirət həyatına inam vardır.

**BİLİRDİNİZMİ?**

*Zərdüştlüyün şəhadət kəlməsi belədir: “Etiraf edirəm ki, Mazdanın pərəstişkarı, Zərdüştün ardıcılıyam. Şər divlərdən üz döndərirəm. Ahuranın dinini qəbul edirəm. Hər cür xeyir, xoş niyyət, xoş təbiət Ahra mazdaya mənsubdur.” Bu şəhadət kəlməsi “fravarane” adlanır və hərgün oxunur.*



**ARAŞDIRIN!**

Zərdüştlüyə nə üçün Məcusilik deyilmişdir?

Zərdüşt inancına görə, xeyir və şər arasındakı mübarizənin sonunda xeyir qalib gələcək. Bu zaman bütün ölülər diriləcək, Hörmüzd qarşısında sorğu-suala gətiriləcəklər. Yaxşı insanlar əbədi nemətlərə layiq görüləcək. Günahkarlar isə əbədi işgəncələrə düçar olacaqlar.

Zərdüşt peyğəmbər öz ardıcıllarına bəzi ayinləri tövsiyə etmişdir. Hər bir zərdüşt gündə beş dəfə dua etməlidir. Bunun üçün o əvvəlcə üzünü, əlini və ayaqlarını yuyur sonra nəzərini salehlik rəmzi olan qarşısındakı atəşə dikir. Bu şəkildə Zərdüşt Ahuramazdaya dua edir, Anqra manyunu isə lənətləyir.

Zərdüştlüyün bir neçə böyük bayramı vardır. Taxıl yığımı vaxtı “Paitişahya” bayramı, mal-qaranın yaylaqdan qayıtdığı vaxt “Ayatrima” bayramı qeyd olunur.

Müasir dünyada zərdüştlərin sayı çox azdır. Dünyada zərdüştlərin sayı 130 minə qədərdir. Onlar əsasən Hindistanda yaşayırlar. Hindistanda yaşayan zərdüştlərə Parsiler deyilir. Onların izlərini bəzi yezidi kürdlərin və Qafqaz xalqlarının arasında da görmək olar. Bu günə qədər Bakıda –Suraxanıda atəşpərəstlərin məbədi fəaliyyət göstərmişdir.

## VI. ÇİN VƏ YAPON DİNLƏRİ

Bu gün Çində Yəhudilik, Xristianlıq və İslamın xaricində rəsmi olaraq mövcud olan dinlər, Konfutsiçilik, Taoizm və Çinin xaricində Yaponiyada ortaya çıxaraq yayılan Şintoizmdir.

### A. Konfüçyanizm



Konfüçyanizm Uzaq Şərqdə geniş yayılmış dinlərdən biri olub, e.ə. VI-V əsrlərdə Çində yaranmışdır. Bu dinin banisi "Konfüçyüs" adlı Çin filosofu hesab edilir.

Konfüçyüs on doqquz yaşından etibarən bir məktəb açmış və tələbə yetişdirməyə başlamışdır. 50 yaşından etibarən bəzi rəsmi vəzifələrdə çalışmışdır.

Konfüçyüsün əsas məqsədi zamanının insanlarına keçmişin gözəl bir izahını verə bilməkdir. O, gəncləri siyasi vəzifələrə hazırlamaya çalışmış, tələbələrini ədəbiyyat, tarix, fəlsəfə və əxlaq təhsili almaya təşviq etmişdir. Könfüçyüsün qayəsi ideal insanlardan təşkil olunan cəmiyyət qurmaq olmuşdur. Kofüçyüsün düşündüyü ideal insan və ideal cəmiyyət fikri, onu ideal bir dövlət qurmaq düşüncəsinə gətirib çıxarmışdır.

Konfüçyüs heç bir zaman bir din yaratmağı düşünməmişdir. Lakin onun ölümündən sonra adına bir məbəd inşa edilmiş və düşüncələri bir dini təlim olaraq tanınmağa başlamışdır.

Xarakter etibarilə konfusiçilik sosial-əxlaqi təmayüllü bir təlimdir. Bu təlimə görə, dünyanı idarə edən qüvvələr səmada yerləşir. Səmada baş verənləri dərk edən adam normal şəxsiyyət hesab edilir. Əksinə, xırda məsələlərlə məşğul olan alçaq təbiətli adam mənfi tip (balaca adam) sayılır.

**MÜTALİƏ EDİN!**

Konfutsiçiliyə görə iqtidar sahibi olanların beş üstün şeyə dəyər verib, dörd pis şeydən uzaq durmaları lazımdır. Beş üstün şey bunlardır:

- Xərcləyərkən israf etmədən faydalı olmaq
- Xalqına peşmanlığa sövq etməyən vəzifələr vermək
- Acgözlülük etmədən istədiyini almaq
- Qürurlu olmadan etibar qazanmaq
- Qorxuducu olmadan uca olmaq

Dörd pis şey bunlardır:

- Xalqa heç bir şey öyrətmədən ölümə sürükləmək, buna zülm deyilir.
- Xəbərdar etmədən ani olaraq iş yükləmək, buna basqı deyilir.
- Təcili olmayan əmrlər verib, bunların yerinə yetirilməsini istəmək, buna qəddarlıq deyilir.
- İnsanlara bir şey verərkən xəsis olmaq, buna yersiz davranma deyilir.

Konfüçyanizmə görə, insanlığın mənası "tao" adlı mənəviyyat yolunu düzgün getməkdən ibarətdir. Bunun üçün insanda hümanistlik, ədalət, ağıl, mərdlik, ehtiyat, itaət, məhəbbət, sədaqət, mənlik və s. xüsusiyyətlər olmalıdır.

Konfüçyanizmdə bütün əxlaqi normlar " ifrat və təfritdən uzaq orta yol" prinsipinə tabedir. Cəmiyyət inzibati-hüquqi yaxud iqtisadi normlarla deyil, yalnız və yalnız əxlaqi normlarla idarə olunmalıdır. "Dövlət vahid ailədir" prinsipi konfutsiçiliyin əsas təlimlərindəndir.

Konfüçyanizmin mövqeyi bu gün də Çində güclüdür. Bu təlimin əxlaqi idealları ölkədə geniş təbliğ olunur. Davranışında Konfüçyüsün tövsiyə etdiyi fəzilətləri əks etdirən insan başqaları üçün təqlid nümunəsi sayılır.

Konfüçyanizm XVII əsrdə Yaponiyaya nüfuz etmiş, təhsil sisteminə, dövlətçilik prinsiplərinə güclü təsir göstərdiyindən əhali arasında geniş yayılmışdır və bu gün də öz təsirini saxlamaqdadır. Konfüçyanizmin təbliğ etdiyi əxlaq normaları Çin-Yapon ailə və cəmiyyətində insanlar arasındakı münasibətlərin düzgün istiqamətləndirilməsində mühüm rol oynayır.



### B. Taoizm Dini

"Tao" yol, qanun deməkdir. Qədim çinlilər Taoda "Tien Tao" (göyün yolu) mənasında bəhs etmiş və bu qavramı "Yen Tao" (İnsanın yolu) ilə qarşılaşdırmışlar. Çinlilərə görə, göyün yolu parlaq, müqəddəs və doğrudur. İnsanın yolu isə qaranlıq və göyün yolunun əksidir.

Taoizmin banisi Lao-Tsu ( təqribən e.ə VII əsr ) sayılır. Əsl adı Li Tandır. Lao Tsu ona sonradan verilən ləqəbdir. Mənası "Yaşlı alim", "Filosof" deməkdir. Həyatı haqqında çox az şey bilinir. İmperator sarayında arxiv məmuru vəzifəsində işlədiyi bilinməkdədir.

**BİLİRDİNİZMİ?**

Taoizmdə ölüm və ölümdən sonrakı həyatdan bəhs edilməsinə baxmayaraq, cənnət və cəhənnəm mövzularından açıqca bəhs olunmur.

Taozimin müqəddəs kitabının adı "Tao te King" adlanır. Lao Tsunun fikir sisteminin əsasını, Çincə bir termin olan "wu- wey" ilə ifadə etmişdir. Bu sistemə görə insan, dünya nizamına uyaraq yaşamalı, heç bir zəhmət çəkmədən "Tao" nun qanunlarına tabe olmalıdır.

Taoizmə görə, idarəçi nə qədər hərəkətsiz olarsa, işləri o qədər mükəmməl olacaqdır. Hökmdar iş görmədən dövlətini ən mükəmməl şəkildə idarə edə bilər. Lao Tsu müharibəyə qarşı olmuşdur. Müharibə sadəcə sıradan çıxmış nizamı bərpa etmək üçün halaldır. Müharibədə qazanan məğlub olanın yanında olmalıdır.

Lao Tsu əxlaqi prinsiplərə və fəzilətlərə çox önəm vermişdir. Taoizmdə 5 əxlaqi prinsip və 10 fəzilətdən bəhs olunmaqdadır.

Əxlaqi prinsiplər; insan öldürməmək, spirtli içki qəbul etməmək, yalan söyləməmək, oğurluq etməmək, zinadan uzaq durmaq şəklindədir. 10 fəzilət aşağıdakılardan ibarətdir:

1. Ataya övlada yaraşan şəkildə hörmət etmək.
2. İmperator və fikirlərinə hörmət etmək.
3. Bütün yaradılanlara şəfqət göstərmək.

4. Səbirli olmaq və doğru olmayanı doğrulamamaq.
5. Özünü fəqirlərə yardım etməyə həsr etmək.
6. Kölələri sərbəst buraxmaq.
7. Ağac əkmək.
8. Su çəkib, yollar açmaq.
9. Müqəddəs kitabları incələmək və tanrılara uyğun hədiyyələr təqdim etmək.
10. Cahilləri tərbiyə etmək və rifahı yüksəltməyə çalışmaq.

Lao Tsu: “Yaxşılara qarşı yaxşılıq edirəm. Yaxşı olmayanlara qarşı yenə yaxşılıq edirəm. Nəticədə hər kəs yaxşı olur.” demişdir. Lao Tsu insan fəaliyyətlərinin məhsulu olduğu üçün mədəniyyətlərə qarşı çıxmışdır. Hər şeyə rəğmən, Lao Tsunun yaymaq istədiyi dərin həqiqətlər Çin düşüncə sistemində güclü təsir yarada bilməmişdir.

### C. Şintoizm Dini



Şintoizm məhəlli xarakterli din olub, Yaponiyaya xasdır və yaponlar arasında yayılmışdır. Çin dilində “Şinto”- Yaxşı ruhlar deməkdir. Kəlmənin Yaponcada qarşılığı “Tanrıların və ya ruhların yolu” mənasına gələn “kamı no miçi”dir. VI əsrdə Buddizmin Yaponiyaya girməsindən sonra Yaponlar milli inanclarını Buddizmdən ayırmaq məqsədilə “şinto” terminini istifadə etməyə başlamışlar.

Şintoizm digər dinlərə təsir göstərməyən sadə bir dindir. Bu dində təbiət güclərinə və ruhlara sitayiş etmək görülməkdədir. Şintoizmdə iki özəllik əhəmiyyətli önəmə malikdir. Bunlardan biri tipik milli din olması, digəri isə təbiətə pərəstişdir.

Şintoizmdə nə oturuşmuş bir inanc sistemi, nə əxlaqi əmrlər nə də teolojik bir sitem mövcuddur. Buna görə də bir çox araştırmaçı Şintoizmin din olub-olmadığı mövzusunda mübahisə etməkdədir.

Şintoizmdə dünyanın göy, yer və yeraltı olmaqla üç təbəqədən ibarət olduğuna, hər üç təbəqədə də tanrıların olduğuna inanılır. “Amaterasu” adlı günəş ilahəsi baş tanrı sayılır. Şintoizmdə tanrılar xeyir və şər xarakterinə görə bölünmürlər. Tanrılar arasındakı fərq



hər hansı təbiət hadisəsinə bağlılıqdadır. Belə ki, hər tanrı müəyyən bir təbiət hadisəsinin yaradıcısı və himayədarı hesab edilir. Ümumiyyətlə, şintoizmdə təbiət gözəlliklərinə (Fudzi dağına, çiçək açmış ağaclara və s.) pərəstiş əsas sayılır.

Şintoizm Yaponiyada imperator hakimiyyətinin qorunmasına xidmət edir. Məhz Şintoist təlimlərinə görə, imperator tanrıların oğlu sayılır və ona qarşı çıxmaq tanrılara qarşı üsyan etməyə bərabər tutulur.

VI əsrdən başlayaraq, Şintoizmdə buddizm meylləri görünür. Xüsusilə, orta əsrlərdə Buddizmlə qarışmız Şintoizm Yaponiya üçün xarakterik olmuşdur. XVII əsrdə kon-

futsiçilik təlimlərini Şintoizmə daxil etmək meylləri olsa da, yapon ruhaniləri öz dinlərinin toxunulmazlığını qoruyub saxlaya bilmişlər.

Şintoizmdə ibadətlərin mərkəzi sayılan tanrıların olduğuna inanılan yerə "jinya" və ya "jinsa" (tanrı evi) deyilir. Şinto məbədləri təbiətin dini dəyərini artırmaq üçün düzənlənmişdir. Hər məbəd çoxlu və müxtəlif ağaclarla əhatələnmişdir. Yaşlı ağaclar ağacların ən müqəddəsi sayılır. Hazırda Yaponiyada şintoistlərin 80 minə qədər məbədi var. Yeni ildə bu məbədləri 80 milyondan artıq yapon ziyarət edir. Bu məbədlər müəyyən vəzifə daşıyan -hansı ərazinisə himayə edən, əkinləri qoruyan tanrıların şərəfinə tikilmişdir. Şintoistlər öz istəklərini ağac lövhə üzərinə yazıb məbədlərdən asır, tanrılardan xeyir-dua almaq üçün körpələrini doğulduqdan 32-33 gün sonra məbədə gətirirlər.

**BİLİRDİNİZMİ?**

Yaponiyada şintoist olan şəxs eyni zamanda başqa dinlərə də mənsub ola bilir. Yapon dilində din və milliyyət eyni məna daşıyır. Yəni əsl olan Yapon olmaqdır.

Vəhyə dayanan bir qavram çərçivəsində olmasa da Şintoizmin "Kojiki" və "Nihongi" adlanan müdəddəs ədəbiyyatı vardır. Bu kitablarda Yapon adalarının müqəddəsliyindən, dünyanın yaradılışından, Yaponların mifoloji qəhrəmanlarından bəhs olunur.

Bu gün Yaponiyada şintoizmin mövqeləri bir qədər zəifləsə də bu dinin məbədləri qalmaqda və fəaliyyətini davam etdirməkdədir. Yaponiyadan başqa şintoizm Havayda və Braziliyada yayılmışdır ki, bu da həmin ərazilərdə çoxlu yaponun yaşaması ilə əlaqəlidir



## VII. İLAHİ DİNLƏR

Allah-Təala tərəfindən peyğəmbər vasitəsiylə bəşəriyyətə göndərilən və əsli vəhy olan dinlərə "ilahi dinlər" deyilir. Vəhy, Allah-Təalanın bəşəriyyət üçün faydalı olacaq bilikləri insanlar arasından seçdiyi şəxslərə (yəni peyğəmbərlərə) xüsusi tərzdə ötürməsidir.

Öz növbəsində ilahi dinlər də iki qurupa ayrılır:

A. Təhrif olunmuş ilahi dinlər

B. Təhrif olunmamış ilahi din



## A.Təhrif Olunmuş İlahi Dinlər

Günümüzdə təhrif olunmuş dinlər deyildikdə Yəhudilik və Xristianlıq nəzərdə tutulur. Qurani-Kərimdə yəhudilər və xristianlar "Əhli-kitab" adlandırılır. Yəni, onlar Allah-Təalanın göndərdiyi ilahi kitablara tabe olduqlarını iddia edirlər. Allah Hz. Musa peyğəmbər (ə) vasitəsilə yəhudilərə "Tövrat"ı, Hz. İsa (ə) vasitəsilə xristianlara " İncil" i göndərmişdir. Yəhudilik və xristianlıq əslində ilahi din idi. Lakin sonradan onların hər ikisinin də ilahi kitabları təhrif edildi, dini hökmləri dəyişdirildi. Bütün müsəlmanlar yəhudilərlə xristianların kitablarına ("Tövrat" və "İncil"ə) və bu kitabların verildiyi peyğəmbərlərə Musa (ə) və İsaya (ə) iman edirlər. Həmçinin etiraf edirlər ki, bu dinlər təhrif edilmişdir. Bununla belə, İslam dininin əhli-kitaba münasibəti mötədildir.

### 1.Yəhudilik



Allah-Təala tərəfindən Həzrət Musa peyğəmbər (ə) vasitəsilə Bəni İsrail adlı ümmətə (yəhudi milləti o zaman belə adlanırdı) göndərilmiş dinə yəhudilik deyilir. Həzrət Musaya (ə) endirilmiş müqəddəs kitabın adı "Tövrat" dır.

Yəhudiliyin İslamdan, Xristianlıqdan və digər dünya dinlərindən fərqli göstərən əsas özəlliyi "müqəddəs torpaq" anlayışıdır. Yəhudilər bugünkü Fələstin bölgəsini tanrının onlara bəxş etdiyi müqəddəs yer olaraq görürlər.

Yəhudi inanc sistemində önəmli yer tutan inanclardan birisi də "Məsih" inancıdır. Bu inanca görə, dünyanın sonunda Məsih adlı biri zühur edəcək, yer üzündə pozulmuş olan düzəni yenidən quracaq və dünyada Tanrının Krallığı adlı min illik ədalətli bir hakimiyyət mövcud olacaqdır.

**MÜTALİƏ EDİN!**

Yəhudi tarixində adıyla çox əhəmiyyətli yer tutan Əzra, peyğəmbər deyildir. Yəhudi din alimləri olan rabbilər onu Hz. Musa ilə müqayisə etmiş və onun da Hz. Musa kimi Tövratı almaya layiq olduğunu irəli sürmüşlər. Rabbilərə görə, Hz. Musa daha öncə gəlməsəydi, tövrat Əzraya veriləcəkdi. Əzranın yəhudi tarixində önə çıxması Babil sürgünü dönüşündən sonra olmuşdur. Beləki yəhudilər m. ə. 586-cı ildə Yəhudi Krallığının süqutundan sonra Babilə sürgün olunmuşlar. Bu sürgün yarım əsr davam etmiş və tarixdə "Babil sürgünü" adı ilə yadda qalmışdır. Əzra Babildən qayıtdıqdan sonra İsrail torpaqlarında yaşayan yəhudilər arasında tamamilə unudulan Tövratı təfsiri ilə birlikdə Hz. Musadan təxminən səkkiz əsr sonra yenidən yazmışdır.

Əzranın önəmli işlərindən biri də yəhudilərin yəhudi olmayanlarla və belə qadınlarla evlənməsini qadağan etməsi, evlənmiş İsrailoğullarının boşanmalarını istəməsidir. Beləliklə Əzra İsrailoğulları mərkəzli etnik din olaraq yəhudiliyin tarixi inkişafında önəmli rol oynamışdır. Həmçinin o, yəhudi adət və ənənələrinin yenidən həyata keçirilməsi üçün işlər görmüşdür. Bütün bu işləriylə Əzra yəhudiliyin bugünkü şəklini almasında ciddi rol oynamışdır.



Yəhudilik hazırda mövcud olan ilahi mənşəli dinlərin ən qədimi olsa da, ardıcıllarının sayı baxımından çox geridə qalır. Bu gün bütün dünyada yəhudiliyə etiqad bəsləyənlərin sayı 18-20 milyondan ibarətdir. Bunların təqribən 4,4 milyonu İsraildə, 6 milyonu ABŞ-da, qalanları Avropa və dünyanın digər ölkələrində yaşayır.

Bəni İsrail İbrahim peyğəmbərin (ə) nəvəsi Həzrət Yəqubdan (ə) törəmişdir. (İsrail –Yəqub peyğəmbərin (ə) ləqəbi idi). İslam mənbələrindəki məlumata görə, "İsrail" sözünün mənası "Allahın bəndəsi" deməkdir. Lakin yəhudilər iddia edirlər ki, "İsrail" – "Allahla güləşib ona qalib gələn" mənasını bildirir. İndiki "Tövrat"da yazılıb ki, guya Həzrət Yəqub (ə) səhrada Allahla güləşib onu yıxmış, buna görə də Allah ona bu ləqəbi vermişdir. Yəqubun (ə) 12 oğlundan dördüncüsünün adı "Yəhuda" idi. Onun adı ilə İsrail oğullarına "yəhudi" deyilir. Yəhudilərin müqəddəs mərkəzi Qüds şəhərindəki müqəddəs məbəddir. Vaxtilə Həzrət Süleyman peyğəmbər (ə) tərəfindən tikilmiş həmin məbədin yerində hal-hazırda müsəlman məscidi yerləşir. Müsəlmanlar bu məscidə ehtiramla yanaşaraq, onu "Beytul-Müqəddəs" (Müqəddəs Ev ) adlandırırlar.

Yəhudiliyin simvolu yeddi qollu şamdan və bir-birinə qovuşaraq altıbucaqlı fiqur əmələ gətirmiş iki üçbucaqdır.



### 1.1. Yəhudilikdə İnanc və Əxlaq Sistemi

Yəhudiliyə qədər heç bir dində vahid Allah ideyası (inancı) bu dərəcədə qabarıq şəkildə ifadə edilməmişdir. Yəhudilik dinlər tarixində ilk dəfə olaraq çoxallahlıqdan imtina etmiş, Allahın bir olduğunu qəbul etmişdir. Allah bütün mövcudatın ilkin səbəbidir. O, hər yerdə, göydə və yerdə, qaranlıqda və işıqdadır. Hər şeyin fövqündədir. Allahın tayı və bənzəri yoxdur. O, qüdrətlidir, əzəli və əbədidir. Onu təbiət deyil, O təbiəti yaradandır.

**QEYD EDİN:**
Yəhudi qaynaqlarına görə, "On nəsihət" i Allah Tur dağında Musa (ə)-a vəhy etmişdir.

Yəhudiliyin insanlara başlıca nəsihəti Allah sevgisi ilə bağlıdır: "Allahı sev, Rəbbini bütün qəlbinlə sev. Bu sevgini öz övladlarına da təlqin et. Evdə də, yolda da, hər yerdə Allahı düşün."

Yəhudilikdə məşhur olan "on nəsihət" yəhudi əxlaqının əsas hissəsini təşkil edir:

1. Məndən başqa tanrıların olmasın.

2. Özün üçün büt hazırlamayacaqdın. (Yəni nə öz əlinlə düzəltdiyin şeylərə, nə də Allahın yaratdıqlarına pərəstiş etmə. Pərəstiş ancaq hər şeyin yaradanı Allaha olmalıdır.)

3. Rəbbin Allahın adını boş yerə çəkmə. (Çünki Rəbb Onun adını boş yerə çəkəni cəzasız qoymaz. Bu nəsihətin mənası odur ki, Allaha boş yerə and içmə, yeri gəldi-gəlmədi yalanını Allahın adı ilə doğru kimi qələmə vermə)

4. Şənbə gününü xatırlayıb, onu müqəddəs bil. (Altı gün işlə, bütün işlərini gör, yeddinci gün isə heç bir iş görmə -şənbə günü Rəbbin Allah üçündür. Şənbə gününü yəhudilər

"şəbat" adlandırırlar. Yəhudi əqidəsinə görə Allah kainatı altı gün ərzində yaratdıqdan sonra şənbə günü dincəlmişdir.)

5. Atanın və ananın hörmətini saxla. (Böyüyə və valideynə hörmət əməlisalehliyin göstəricisidir.)

6. Öldürmə. (Həyat Allahın insana bəxş etdiyi ən gözəl nemətdir. Bu nemətə qıymaq, insanı öldürmək Allahla allahlıq etmək iddiasıdır, halbuki sənin öz canın da sənin əlində deyil, Allahın əlindədir. Allahın izni olmadan onu ala bilməzsən.)

7. Zinakarlıq etmə. (Zinakarlıq ailəyə xəyanətdir və ailəni sarsıtdığı kimi cəmiyyəti də sarsıdar. Ər-arvad münasibətləri təbii ki, müqəddəs münasibətlərdir. Zinakarlıq Allahın müəyyən etdiyi qaydalara zidd olduğu üçün Allaha qarşı cinayətdir.)

8. Oğurluq etmə. (Başqasının malını gizlicə götürmək, qəsb etmək, aldığın borcu qaytarmamaq, fırıldaq işlətmək pis əməllər kimi səciyyələndirilir, belə əməllərdən çəkinmək lazımdır.)

9. Qonşuna qarşı yalan şahidlik etmə. (Yalan, böhtan, xəbərçilik ən pis qəbahətlərdir, insanlar arasındakı münasibətləri pozur, etibarsızlıq doğurur.)

10. Qonşunun evinə göz dikmə; (qonşunun arvadına, köləsinə, atına, eşşəyinə göz dikmə. Bu o deməkdir ki, insan niyyətini təmiz saxlamalı, başqasına həsəd aparmamalı, başqasının malında gözü olmamalıdır.)



### 1.2. Yəhudilikdə Məzhəblər və Dini Cərəyanlar



Yəhudi məzhəblərini üç qrupda incələmək olar:

1. Xristianlıqdan öncəki yəhudi məzhəbləri
2. İslamdan sonrakı yəhudi məzhəbləri
3. Günümüzdəki yəhudi məzhəbləri

Xristianlıqdan öncəki yəhudi məzhəbləri bunlardır:

a. Hasidilər: İbrani dilində "dindarlar" mənasına gələn bu məzhəb mənsubları dövlətdən və siyasətdən uzaq özlərini məbədin təmir və təmizlənməsi işinə vermiş dindar kimsələr idi.

b. Fariseylər: Bu məzhəb mənsubları özlərinə alimlər və din qardaşları deyilməsini istəyirdilər. Bu məzhəb yəhudiliyə əsas şəkil verən böyük məzhəb sayılır. Fariseylər yazılı tövratla yanaşı, Hz. Musadan şifahi olaraq nəql olunan şifahi tövratı qəbul etmişlər. Bunlar yazılı tövratda olmayan lakin şifahi tövratda olan nəslərdən bir inanc sistemi ortaya çıxarmışlar.

c. Sədduqilər: Bu məzhəb etiqad və əməldə fariseylərin tam əksi olan məzhəbdir. Həmçinin sədduqilər fariseylərin əksinə dövlətdə aristokrat sinfini təkil etmişlər. Sədduqilər məbədin Romalılar tərəfindən dağıdılmasından sonra xalq üzərindəki təsir gücünü itirmiş və zamanla tarixdən silinmişlər.

d. Esseylər: Bu məzhəb fariseylər və sədduqilərin müasiri sayılan mistik məzhəbdir. Mənbələrdə qeyd olunduğuna görə, esseylər toplu halda yaşayırdılar. Məzhəb bir sirr təriqəti kimi idi. Məzhəb mənsubları daima ağ geyinirdilər. Kənd təsərrüfatı ilə məşğul olur və subay yaşamağa üstünlük verirdilər. Bunlar həmçinin ət yemir. Esseylərin inanc əsasları fariseylərə yaxındır. Bəzi alimlər esseylərin xristinalığın bir qolu və davamçısı olduğunu söyləyirlər.

İslamdan sonrakı yəhudi məzhəblərindən biri fariseylərin davamçısı olan "Rəbbani" və qismən sədduqi məzhəbinin görüşlərini mənimsəyən "Qarailik"dir.

Rəbbani yəhudilər yazılı tövratdan daha çox öncəki hahamların müxtəlif məsələlərdəki görüşlərindən ibarət Talmutu əsas almış və Tövratı sadəcə ibadət zamanı istifadə etmişlər.

**BİLİRDİNİZMİ?**

Qarailik məzhəbinə mənsub olan Yəhudilər aprel ayının 13-dən başlayaraq 70 gün oruc tuturlar.

"Qarailik", rəbbani yəhudiliyin qatı talmutçuluğuna qarşı çıxan və sayları az olsa da bugünə qədər varlığını davam etdirən bir məzhəbdir.

Qarai kəlməsi ərəbcə "qiraət" kəlməsiylə eyni mənadadır. Bunlar əsasən yəhudiliyin əhkam və prinsiplərindən ibarət olan tanah kitabına üstünlük vermişlər.

Qarailərdə ibadət sabah və axşam olmaqla gündə iki dəfə fərzdir. Bu məzhəb mənsublarının bir qismi bu gün Misir və İsraildə yaşamaqdadır.

Yəhudiliyin bu qoldakı başqa bir məzhəbi İsəviyyə məzhəbidir. Məzhəb adını qurucusu, Əbu İsa İshaq b. Yaqub əl-İsfəhanidən götürmüşdür. Bu şəxs xəlifə Mənsur zamanında yaşamış və əməvi xəlifəsi Mərvan b. Məhəmməd əl-Hammar zamanında fikrini yaymağa başlamışdır. Yəhudilərdən çoxu ona tabe olmuşdur. O özünün gözlənilən Məsih olduğunu, yəhudiləri qurtarmaq üçün Allah tərəfindən göndərildiyini irəli sürmüşdür. Yəhudilərin gündə üç dəfə olan ibadətlərini yeddi dəfəyə çıxarmışdır. Tövratda əmr edilən dini hökmlərin bir qismini də tövratdan çıxarmışdır.

**BİLİRDİNİZMİ?**

Reformist yəhudiliyin ortaya çıxmasının ən önəmli səbəbləri 1789-cu ildə baş vermiş Fransız İnqilabı və yəhudilər tərəfindən gözlənilən Məsihin gəlməməsidir.

Müasir yəhudi məzhəbləri bunlardır:

Ortodoks, reformist və mühafizəkar yəhudilik.

Ortodoks yəhudilik digər məzhəblərin ayrılmasıyla ortaya çıxmışdır. Bu yəhudi məzhəbi yazılı tövratın Tanrı tərəfindən Hz. Musaya yazdırıldığına və şifahi tövratın da şifahi olaraq vəhy edildiyinə inanmaqdadır. İsraildə Ortodoks yəhudilik dövlətin rəsmi məzhəbidir.

Reformist yəhudilik, XIX əsrin başlanğıcında Alman yəhudiləri arasında çıxmışdır. Reformist yəhudilər ortodoks yəhudilərin görüşlərini qəbul etmirlər. Bu yəhudi məzhəbi ümumi olaraq yəhudiliyin şabat qanunlarına qarşı çıxan məzhəbdir. Bu məzhəbə görə sineqoqda qadınlarla kişilər bir yerdə ibadət edə bilərlər. Hətta qadınlar haham belə seçilə bilirlər. Bu məzhəb həmçinin dində yenilik tərəfdarı olaraq tanınırlar. Talmutu inkar edib, məsihçiliyi rədd edirlər.

Mühafizəkar yəhudilik, reformist yəhudiliyə təsir etmək üçün yaranmışdır. Bu məzhəb mənsubları ibadətlərini ibranicə yox ingiliscə yerinə yetirilər. Mühafəzakarlar anası yəhudi olmayan uşağı yəhudi qəbul etmirlər. Bu yəhudi məzhəbinin ən başlıca xüsusiyyəti isə sionist (milliyyətçi yəhudi) olmalarıdır.

### 1.3. Yəhudilikdə İbadət və Bayramlar



Yəhudilər ibadətlərini sineqoqlarda həyata keçirirlər. Sineqoq Qüdsdəki məbədin dağıdılmasından sonra yəhudilərin ibadət üçün istifadə etdikləri yerə verilən addır. Sineqoqlarda rulon şəklində Tövrat əlyazmalarının saxlandığı "Aron ha-Qadeş" adlanan müqəddəs bir yer vardır. Sineqoqlarda həmçinin yəhudilərin dini və milli simvollarından biri olan yeddi qollu şamdan olur.



İbadət zamanı ən önəmli an, Tövrat rulonlarının boxçalar içərisindən çıxarılması və haham tərəfindən oxunmasıdır. Yəhudilər sineqoqlarda səsli şəkildə Tövrat hissələrini oxuyurlar. Yəhudilərdə ibadət təkcə sineqoqlarda yox evlərdə də yerinə yetirilir. Evlərdə giriş qapısının üzərində "mezuza" adlanan uzun bir boru içərisində tövratdan cümlələr yazılmış rulon olur. Evə girərkən və çıxarkən yəhudilər mezuzaya toxunub barmaqlarını öpürlər. Yəhudilər ibadət zamanı Qüdsə tərəf yönəlirlər. Yəhudi qadınları ibadətlərdə iştirak etmir, sadəcə başları örtülü olaraq kənardan seyr edə bilirlər. Lakin Modernist yəhudilərə görə, qadınlar da kişilərlə bərabər sineqoqda ibadət edə bilər.

İbadət edərkən yəhudi kişilər başlarına "kipa" adlı təkkə qoyar, çiyinlərinə də "tallit" adlı dua şalı dedikləri şal salarlar. Qadınlar da başlarını örtərlər. Yəhudilikdə ibadət günlük və həftəlik olmaqla iki yerə bölünür. Günlük ibadət səhər, günorta və axşam edilir. Həftəlik ibadət isə şənbə günü sineqoqda olur. (Gündə üç dəfə yerinə yetirilən ibadət, ən azı 13 yazı olan və ən azı on nəfərlə olur.) Həftəlik şənbə ibadəti isə cümə günü günəşin batmasıyla başlayır və şənbə günü axşama qədər davam edir. Yəhudilikdə şənbə günü od yandırmaq, işləmək dini baxımdan qadağandır.

**BİLİRDİNİZMİ?**

Yəhudilikdə vacib sayılan qurban ibadəti bugün həyata keçirilmir. Çünki, yəhudiliyə görə qurban ancaq müqəddəs məbəddə yerinə yetirilən ibadətlərdəndir. Onların müqəddəs məbəd saydıqları Süleyman məbədindən bu gün sadəcə qərb divarı qaldığı üçün bu ibadət yerinə yetirilmir.

Yəhudilik xatirələrilə yaşayan bir dindir. Yəhudilikdə mövcud olan bayramlar yəhudi tarixinin önəmli dönüş nöqtələri və

yaşayış tərzi ilə əlaqəlidir. Bu bayramlardan biri olan "Roş Haşana" Yəhudi təqvimində yeni il bayramı hesab edilir. Sentyabr-oktyabr aylarında 2 gün qeyd olunur. Yəhudi inancına görə bu bayramda insanın qədəri təyin olunur.

Digər bir bayram "Yom Kippur"dur. Roş Haşana bayramının ilk günündən etibarən davam edən 10 günlük tövbə zamanının sonunda qeyd olunan "kəffarət günü" bayramıdır. Bu bayramda yəhudilər tövbə və ibadətlə məşğul olurlar. Bu bayram günü İsraildə təcili xidmətlər xaricində heç bir dövlət işi görülmür. Bu bayramlardan başqa yəhudilikdə sukkot (çadırlar), Simha tora (tövratın xətm bayramı), hanuka, fısıh, şavuot kimi bayramları da mövcuddur.

İZAH EDİN!

*"Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi xatırlayın, (Tövratda axirüzzaman peyğəmbər barəsindəki) buyurduğumu yerinə yetirin ki, Mən də sizinlə (sizi Cənnətə varid etmək barəsində) olan əhdə vəfa edim. Yalnız Məndən qorxun! Sizin əlinizdəkini (Tövratı) təsdiqləyici kimi göndərdiyimə (Qurana) iman gətirin! Onu inkar edənlərin əvvəlincisi siz olmayın! Mənim ayələrimi (Tövratdakı hökmlərimi) ucuz qiymətə (dəyərsiz dünya malına) satmayın və ancaq Məndən qorxun!"* (Bəqərə 2/40-41)

*"Biz İsrail oğullarından əhd almış, onlara peyğəmbərlər göndərmişdik. Hər dəfə bir peyğəmbər onlara ürəklərinə yatmayan bir hökm gətirdikdə (həmin peyğəmbərlərin) bir qismini yalançı hesab edər, bir qismini də öldürərdilər."* (Maidə, 5/70)

Yuxarıda keçən ayələr işığında Qurani-Kərimin Yəhudiliyə baxışını izah edin!



## 2. Xristianlıq



Allah-Təala tərəfindən Həzrət İsa peyğəmbər vasitəsilə insanlara göndərilmiş ilahi dinə "xristianlıq" deyilir. Qədim yunan dilindən tərcümədə "xristian" – "məsihi" (yəni məsihə inanan) deməkdir. Qədim yəhudilərdə padşah hakimiyyətə gələndə din xadimləri onun alnına müqəddəs yağ sürtürdülər. "Məsih" – alnına yağ sürtülmüş, yəni hakimiyyəti təsdiq edilmiş şəxsə deyilir.

Xristianlığın müqəddəs kitabı "İncil"dir. Həzrət İsa Allahdan vəhy olaraq aldığı əsl "İncil"i camaata təlim edirdi. Lakin Həzrət İsanın dedikləri o dövrün ali təbəqədə olan insanların xoşuna gəlmədiyi üçün, onu öldürmək qərarına gəldilər. Allahın qüdrət ilə Həzrət İsa düşmənlərin əlindən xilas oldu, onun yerinə onu öldürmək istəyən başqası çarmıxa

İZAH EDİN!

Xristianlar Hz. İsanın çarmıxa çəkildiyinə inanırlar. Hz. İsanın çarmıxa çəkilməsi Hz. Adəmdən bugünə qədər gələn insanoğlunun günahına kəffarət olması yönündən xristianlıqda çox önəmli bir hadisədir.

İslamın bu mövzudakı görüşünü Qurani-Kərimin Nisa surəsinin 157-158-ci ayələrini incələyərək, İslamın və xristianlığın Hz. İsaya yüklədiyi vəzifəsini izah edin.

çəkildi. Bundan sonra Həzrət İsanın dini təlimləri tamamilə dəyişdirilərək, əslindən uzaqlaşdırıldı. Ömrünü tək Allaha imanı təbliğ etməyə sərf etmiş Həzrət İsanı "Allahın oğlu" adlandırdılar.

Bu gün xristianlıqda "təslis", yəni üç tanrıya iman hakimdir. Kainatı yaradan Allah – ata, Həzrət İsa – onun oğlu sayılır, Ruhul-qüdüs (Müqəddəs Ruh) isə bunlar arasında vasitəçi hesab olunur.

### 2.1. Xristianlıqda İnanc Əsasları



Əslinə baxılarsa, ortaya çıxdığı zamanda xristianlıq monoteist (tək tanrıya inancı əsas alan) bir dindir. İncillərdə və digər müqəddəs mətnlərdə bu anlayışı dəstəkləyən ifadələr mövcuddur. Ancaq kilsənin doğru qəbul etdiyi İncil mətnlərində İsa üçün "Tanrının Oğlu" Allah üçün də "Ata" terminlərinin istifadə edildiyi görülməkdədir. Xristianlığın müqəddəs kitabında keçən "Mən və Ata birik", "Atanızın Ruhu", "Allahın Ruhu" və s. ifadələr, təslis olaraq şərh olunur.

Xristianlıqdakı bu inanc əsaslarının ilk həvarilərdən etibarən müəyyən edilməyə başlandığı, son şəklini isə IV və V əsrlərdə olmuş xristian konsillərində nəticələndiyi qeyd olunur. Bununla birlikdə inanclar mövzusunda həm kilsələr, həm də məzhəblər arasında bəzi ortaq ana ünsürlər olduğu kimi fərqli anlayışlar da vardır.

Bəzi tarixçilərə görə, monoteizm inancının hakim olduğu Yəhudilik dini ətrafında çıxmış olan "təslis" inancı, böyük bir ehtimalla İsanın tanrılaşdırılmasının təbii bir nəticəsidir. Bununla yanaşı Ruhul-Qüdüsün də ayrı bir ilahi varlıq sayılması üç ayrı tanrı anlayışın ortaya çıxmasına səbəb olmuşdu. Daha sonrakı dövrlərdə bəzi kəlami ifadələrlə açıqlanmağa çalışılan təslisin üç ünsürü (Ata, Oğul, Ruhul-qüdüs) xristianlıqda bir üluhiyyətin üç ayrı görünüşü olduğunu göstərir.

Xristianlıqdakı inanc əsaslarından biri də "inkarnasyon"inancıdır . Bu inanc Tanrının İsa Məsihdə bədənləşərək yer üzündə bir bəşər kimi yaşamasını ifadə edir. Xristianlara görə, Həzrət İsa sadəcə bir peyğəmbər deyil, eyni zamanda İlahi Tanrının oğludur.

Xristian inanc əsaslarında mövcud olan bir başqa inanc, "kəffarət" təlimidir. Xristianlıqdakı bu inanca görə, insanlığın atası olan Adəm peyğöəmbər, Tanrı ilə etdiyi əhdi pozmuş, itaətsizliyi ilə insanlığı tanrının gözündən salmışdır. Xristianlığın kəffarət inancına görə, İsa Məsih könüllü olaraq çarmıxda bütün insanların günahlarına kəffarət olaraq asılmış və bununlada insan ilə tanrı arasındakı pozulan münasibətlətləri bərpa etmişdir.

### 2.2. Xristianlıqda Məzhəblər və Dini Cərəyanlar.

Xristianlıq əsasən, üç böyük qola bölünmüşdür.

a) Katoliklik
b) Pravoslavlıq
c) Protestantlıq

Katolik məzhəbi: Xristianlığın ən çox mənsubu olan məzhəbidir. Bu məzhəb özünü Hz. İsanın vəkili olan Petrusa bağlamaqdadır. Katoliklər Roma papasının dini hakimiyyətini tanıyır, onu öz rəhbərləri hesab edirlər. Papa bu gün eyni zamanda Vatikan dövlətinin prezidentidir.

Katolik məzhəbinin əsas xüsusiyyətləri bunlardır:

- Dini rəhbər papadır. Papa İsanın vəkili, Petrusun davamçısıdır.
- Papa heç vaxt səhvə yol verməyən hakimdir.
- Roma şəhəri katolik məzhəbinin mərkəzidir və mənəvi yöndən digər kilsələrdən üstündür.
- Katolik kilsəsi vəhyin qaynağı olaraq müqəddəs kitab və adət-ənənəyə böyük önəm verir.
- Katolik kilsəsi Hz. Məryəmin də göyə yüksəldiyinə, oğul tanrının yəni Hz. İsanın və kilsənin anası olduğuna inanmaqdadır.
- Katolik kilsəsinə görə rahiblərin subay olması zəruridir.
- Boşanmaq qadağandır.
- Yeni ili 25 dekabrda qarşılayırlar.
- Xristian sakramentlərindən yalnız yeddisini qəbul edirlər.

Provoslov məzhəbi: Pravoslav məzhəbinə bağlı olan xristianlar isə papanın hakimiyyətini tanımır, "patriarx" adlı dini rəhbərə tabe olurlar.

Pravoslav məzhəbinin əsas xüsusiyyətləri bunlardır:

- Pravoslavlığın ruhani lideri patriarxdır. Patriarx papa kimi tək rəhbər deyil.
- Müqəddəs ruhun sadəcə atadan çıxdığına inanırlar.
- Papanın heç vaxt səhv etmədiyi inancını qəbul etmirlər.
- Hz. İsa, Hz. Məryəm və xristian əzizlərinin şəkil və heykəllərindən ibarət olan ikonlara önəm verirlər.
- Provoslav rahiblər istədikləri təqdirdə evlənə bilirlər. Ama patriarxlar evlənə bilməzlər.
- Boşanmaq sərbəstdir ancaq müəyyən şərtlərə bağlıdır.
- Bu məzhəbdə xristianlığın simvolu olan xaçın eninə və uzununa olan qolları eyni ölçüdədir.
- Yeni ili yanvar ayının 6-da qeyd edirlər.
- Yeddi xristian sakramentini qəbul edirlər.



Protestan məzhəbi: Orta əsrlərdə kilsəyə qarşı dini-siyasi mübarizə məktəbi kimi meydana çıxmış protestantlıqda isə papaya qarşı tam itaətsizlik və kilsə hakimiyyətinə etiraz motivləri əsas sayılır. Protestantlıq məzhəbinin bəzi qolları, habelə, bir çox başqa cərəyanlar xristianlığın qeyri-ənənəvi təriqətləri hesab edilir.

Protestant məzhəbinin əsas xüsusiyyətləri bunlardır:

- Papanın heç bir səhv etmədiyi fikrini və hakimiyyətini qəbul etmirlər.
- Dini anlamaq və izah etmək üçün kilsəni yox, müqəddəs kitabı əsas alırlar.
- Sadəcə vaftiz və evharistiya sakramentini qəbul edir, digərlərini qəbul etmirlər.
- Qurtuluş üçün əməldən dah çox imanı əsas alırlar.
- Ruhbanlığı qəbul etmirlər.

- Əzizlərə və Hz. Məryəmə əhəmiyyət vermirlər.
- Kilsələrinə şəkil və heykəl qoymurlar.
- Günah çıxarma ayinini qəbul etmirlər.
- Rahibləri evlənə bilirlər.
- İbadət və ayinlər hər ölkənin öz dilində həyata keçirilir.

Anqlikan kilsəsi: XVI əsrdə İngiltərədə ortaya çıxmış xristian məzhəbidir. Bu məzhəb protestantlığın İngiltərəyə məxsus bir şəklidir. Bu məzhəb mənsubları da pravoslavlar kimi papanın hakimiyyətini qəbul etmirlər.

Baptistlər məzhəbi: Hollandiyada ortaya çıxmış, 30 milyon mənsubu olan "Baptistlər" protestant məzhəbidir. Baptizm məzhəbinə görə hər bir insan vücudunu tamamilə suda isladaraq vaftiz olunmalıdır. Bu İsaya imanın qəti bir simvolu sayılmaqdadır və bu ayinə yetişkin olan hərkəsin uyması vacib sayılır.

Adventistlər məzhəbi: Xristianlıqda olan dini cərəyanlardan biri də 1831-ci ildə ABŞda William Miller adlı bir kəndçi tərəfindən qurulan "Adventistlər" hərəkatıdır. Bunlar İsanın gəlişini böyük bir ümidlə gözləyən bir qrupdur. Bugün adventistlərin "Yeddinci günə bağlı Adventistlər" adlı qolu fəaliyyətlərini davam etdirir.

### 2.3. Xristianlıqda İbadət və Bayramlar



Xristianlıqda ayin və dini mərasimlər "sakrament" adlanır. Pravoslav və katolik məzhəblər yeddi sakramenti qəbul edir, protestan məzhəbləri isə bu yeddi sakramentdən sadəcə ikisini (evharistiya və vaftizi) qəbul edirlər. Xristianlıqdakı yeddi sakrament bunlardır:

**Vaftiz:** suya salma və ya bədənin müəyyən qisimlərini yumaqla edilir. Xristian imanını qəbul etməyin ilk mərhələsi hesab edilir. Xristian məzhəblərinin çoxu körpəlik zamanı vaftizi əsas hesab edirlər.

**Konfirmasyon:** vaftizlə xristian olan şəxsə Müqəddəs ruhun verilməsi ayinidir.

**Tövbə, günah etirafı:** İnsanın etdiyi günah və ya xətasını kilsədə etiraf etməsi və rahibin də Ata, oğul və Müqəddəs ruh adına bu günahı bağışlaması ayinidir.

**Evharistiya, komünyon: İsanın çarmıxa çəkilmədən öncə həvariləri (müridlər) ilə yedi**yi son axşam yeməyinin xatirəsinə icra edilən sakramentdir. Bu ayinə həmçinin "çörək və şərab ayini" də deyilir. Xristian inancına görə bu ayindəki çörək İsanın bədənini, şərab isə qanını təmsil edir.

**Evlilik:** evlənəcək namizədlər üçün bəzi özəl duaların oxunduğu ayindir.

**Rahib təsdiqi:** din adamlarının rahib olaraq qəbul olunma ayinidir.

**Xəstə yağlama:** ölmək üzrə olan xəstəyə xüsusi dualar oxunaraq yağ sürtülməsi ayinidir.



Xristianlıqda ibadətlər günlük həftəlik və illik olmaqla üç yerə bölünür. Günlük ibadətlər əvvəllər yeddi vaxt ikən sonradan gündə iki vaxta salınmışdır. Həftəlik ibadət isə bazar günü səhər və axşam olmaqla iki vaxtda yerinə yetirilir. İllik ibadət isə bayram və anma günü şəklindədir.

Xrisitianlıqda qeyd olunan bayramlar festival adlanır. Bu festivallardan bəziləri aşağıdakılardır:

Xristianlığın baş ayini kilsə ibadəti sayılır. Xristian olan hər bir şəxs dua etməlidir. Pravoslavlıqda ikonalara ibadət mühüm yer tutur. Xristianlıqda xaçsız heç bir ibadət icra edilmir. Xaç xristiana İsa Məsihin onun yolunda xaçda çarmıxa çəkilərək əzabla ölməsini xatırladır. Xaça pərəstiş etdiklərinə görə xristianlara həm də xaçpərəst deyilir. Katoliklər dörduclu, pravoslavlar altı və səkkiz uclu xaça ibadət edirlər.

**Noel:** İsanın doğulmasını anma günü olaraq qeyd olunan bayramdır. 25 dekabrda qeyd olunur. Bu festivala həmçinin “kristmas” da deyilir. Kristmas öncəsi bəzi dini hazırlıqların həyata keçirildiyi dönəmə isə “advent” deyilir.

**Epifani:** 6 yanvarda qeyd olunur. İsanın inancsızlara görünməsinin xatirəsinə qeyd olunur. Protestant məzhəbi bunu qeyd etmir. Pravoslavlar 25 dekabrda kristması deyil 6 yanvarda epifanini qeyd edirlər.



**Paskalya:** İsanın çarmıxa çəkildikdən üç gün sonra dirilməsi xatirəsinə qeyd olunur. Katoliklər və protestanlar bu festivalı martın 21-dən sonra ilk tam ayın görünməsindən sonra ilk bazar günü qeyd edirlər. Pravoslav xristianlar isə katolik və protestanların qeyd etdikləri tarixdən bir neçə həftə sonra qeyd edirlər. Xristianlar bu festivaldan öncə 40 gün oruc tutur və dualar edirlər.

Xristianlıqda İsa Məsihə, Müqdəddəs Məryəmə, həvarilərə həmçinin müqəddəslərə məxsus əşyalara da pərəstiş etmək çox məşhurdur. Kilsə və xalq qarşısnda müəyyən xidmətləri olmuş tanınmış şəxslər kilsə tərəfindən müqəddəs qəbul edilir və onlara pərəstiş edilir.

İZAH EDİN!

*Məryəm oğlu Məsih ancaq bir peyğəmbərdir. Ondan əvvəl də peyğəmbərlər gəlib getmişdir. Onun anası isə çox pak (Allahın hökmlərini sidq-ürəkdən təsdiq edən) bir qadın idi. Onlardan hər ikisi (adi insanlar kimi) yemək yeyirdi. Gör Biz ayələri onlara necə başa salırıq, onlar (bu ayələrdən) gör necə üz çevirirlər.* Maidə 5/75

*(Ya Rəsulum!) Biz (Quranı) sənə haqq olaraq, özündən əvvəlki kitabı (bütün ilahi kitabları) təsdiq edən və onu qoruyan (və ya onların doğruluğuna şahid) olaraq endirdik. Sən onların arasında Allahın nazil etdiyi (Quran) ilə hökm et. Sənə gələn haqdan ayrılıb onların nəfslərinin istədiyinə uyma...*Maidə 5/48

Yuxarıda keçən ayələrin işığında Qurani-Kərimin xristianlığa olan olan baxışını izah edin!

### B. Təhrif Olunmamış İlahi Din



Bugünə qədər təhrif olunmadan, pozulmadan qalan yeganə din İslamdır.

#### 1. İslam Dini

İslam İlahi dinlərin sonuncusudur. Bu din VII əsrin əvvəllərində təşəkkül etməyə başlamışdır. İslam sözünün lüğət mənası ərəbcə “təslim olmaq” deməkdir. İslam dini insandan Allahın iradəsinə və müqəddəs qanunlarına şərtsiz təslim olmağı tələb etdiyi üçün ona bu ad verilmişdir. İslam dininin müqəddəs kitabı Qurani-Kərimdir. Qurani-Kərim Allahu-Təalə tərəfindən bu dinin peyğəmbəri olan Muhamməd (s.ə.s) 23 il ərzində tədricən nazil olmuşdur. Yeganə ilahi kitabdır ki, bugünə qədər öz əsli halı təhrif olunmadan qalmaqda davam edir. İslam dininin müqəddəs kitabı Qurani-Kərimdə İslam dini haqda belə buyurulur: **“Şübhəsiz Allah yanında yeganə din İslamdır”** (Ali-İmran 2/19). İslam dini bəşəriyyət üçün xoşbəxtlik və qurtuluş dini olmuşdur. İstənilən cəmiyyətdə istənilən insan fərdi üçün ən yüksək həyat şəraitini təmin edə biləcək ümumbəşəri əbədi dindir.

İslam humanist dindir və insanlığın bütün problemlərinin həllinə çalışır. İslama görə bütün insanlar böyük bir ailənin üzvləri kimidir və eyni hüquqlara malikdir.

İslam ümumbəşəri dindir və bütün bəşəriyyətə gəlmişdir. İslam dininin müqəddəs mərkəzi Məkkə şəhərindəki Kəbədir. İslam dini bugün dünyada ən sürətlə yayılan dindir. Bu din dəyərləri, əxlaq və hüquq normaları sayəsində öz ardıcıllarının sayını artırır. Hal-hazırda dünyada 1 milyard 250 milyon müsəlman yaşayır. Bu da dünya əhalisinin 5/1-ni təşkil edir.

İslamiyyət

- İslama görə bütün peyğəmbərlər İslam peyğəmbəri, onlara vəhy olunan bütün ilahi mesajlar da insanlara İslamı öyrədən mesajlardır.
- İslamiyyət VII-əsrin başlanğıcında Ərəbistanda yayılmağa başlamış ümumbəşəri bir dindir.
- İslamı digər dinlərdən ayıran əsas özəlliyi, Allahın bütün isim və sifətlərində bir olaraq qəbul edilən tövhid inancını önəmlə vurğulamasıdır.

#### 1.1.İslamda İnanc və Əxlaq Sistemi

İslam dinin inanc sistemi tək və bir olan Allaha inanmaqdır. Yəni İslam dini monoteist bir dindir. İslam dininin inanc əsasları aşağıdakılardan ibarətdir:

- Allaha inanmaq. Yəni Allahın varığına, birliyinə, tək olduğuna, ondan başqa bir tanrı olmadığına inanmaq.



- Onun mələklərinə inanmaq. Yəni müxtəlif vəzifələri icra edən gözlə görünməz varlıqlar olan mələklərin olduğuna inanmaq.
- Onun kitablarına inanmaq. Yəni Allahın göndərdiyi bütün kitablara inanmaq.
- Onun peyğəmbərlərinə inanmaq. Yəni Allahın insanları irşad üçün vəzifələndirdiyi bütün peyğəmbərlərə inanmaq.
- Axirət gününə inanmaq. Yəni bu dünyadan başqa axirət dünyasının olduğuna inanmaq.
- Xeyir və şərin Allahdan olduğuna inanmaq.
- Ölümdən sonra dirilmənin haqq olduğuna inanmaq.

**DÜŞÜNÜN**

*İbrahim nə yəhudi, nə də xristian idi. O ancaq hənif (batildən haqqa tapınan, haqqa yönəlmiş olan) müsəlman (Allaha təslim olan) idi və (Allaha) şərik qoşanlardan deyildi.* Ali-İmran 3/67

*Kim islamdan başqa bir din ardınca gedərsə, (o din) heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!* Ali-İmran 3/85

*..Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq islamı bəyənib seçdim.* Maidə 5/3

Yuxarıda keçən ayələrə görə, Quranın ifadə etdiyi İslam hansı mənaları ifadə etməkdədir? Düşünün!



İslam dinini qəbul edən bir müsəlmanın bu inanc əsaslarının hər birinə ayrı-ayrılıqda inanması lazımdır. Bunlara həmçinin imanın şərtləri də deyilir.

Hz. Muhamməd (s.ə.s) öz peyğəmbərlik fəaliyyətinin məqsədini açıqlayan: “Mən insanların əxlaqını kamilləşdirilmək üçün göndərildim.” hədisi İslamda əxlaqın əhəmiyyətini ifadə etmək üçün yetərlidir.

İslam dininə görə, insan hər şeydən əvvəl, bu dünyadakı məqsəd və vəzifələrini bilib, bunlara riayət etməlidir. Ümumilikdə insanın üç cür vəzifəsi vardır: Allaha, özünə və ətrafdakılara münasibətdə daşıdığı vəzifələr.

- Allah qarşısındakı insanın borcu və vəzifəsi Onu tanımaq, böyüklüyünü və qüdrətini layiqincə dərk etmək, Ona ibadət etməkdir.
- İnsanın özünə münasibətdə daşıdığı əsas vəzifə budur ki, özünü tanısın, Allahın onu nə üçün yaratdığını və hansı məqsədlərə çatmalı olduğunu dərk etsin, öz bacarığı səviyyəsində durmadan bu məqsədə doğru irəliləsin.
- İnsanın cəmiyyət və ətrafındakılar qarşısındakı vəzifəsinə gəlincə, İslam dini özünə rəva bilmədiyini başqasına da rəva bilməməyi tələb edir. Yəni İslam dini tövsiyə edir ki, başqaları ilə münasibətdə hər şeydən əvvəl xeyirxahlıq, ehtiram, anlaşma və ədalət prinsiplərini gözləyək.

### 1.2.İslamda İbadət

İslam dinində ibadət şəkilləri üç yerə bölünür:

1. Bədən ilə edilən ibadətlər: Buna namaz və oruc ibadətini misal göstərmək olar.
2. Mal ilə edilən ibadətlər: Buna zəkat verməyi misal göstərmək olar.
3. Həm bədən həm də mal ilə edilən ibadətlər: Buna da həcc ibadətini misal göstərmək olar.



Müsəlmanlar gündə beş dəfə (səhər, günorta, ilkindi, axşam və yatsı) üzlərini Kəbəyə tutaraq namaz qılarlar. Bu beş vaxt namaz fərz namazları adlanır və hər bir müsəlman bunu yerinə yetirməklə məsuldur. Bunun üçün niyyət edib dəstəmaz almaq, yəni təmiz olmaq lazımdır. Namaz müsəlmanın Allah ilə ən yaxın təmasıdır, Ona yaxınlaşmasıdır. Namazı müsəlmanlar kişi və qadın ayrı-ayrılıqda qılarlar. Namaz tək və ya camaatla qılına bilər. Cümə günü müsəlmanların müqəddəs günüdür. Bu gün müsəlmanlar məscidlərdə bir yerə toplanın və günorta namazı vaxtında bu namazın əvəzinə cümə namazı qılırlar.

Müsəlmanlar ildə bir ay hicri təqvimlə ramazan ayını oruc tutmaqla keçirirlər. Bu ay ərzində müsəlmanlar gündüzləri oruc tutaraq sabahdan axşama qədər yemək-içməkdən və haramlardan uzaq durarlar. Bu ayın sonunda müsəlmanlar ramazan bayramı adlı bayramı qeyd edirlər.



Həcc müsəlamanın Kəbəni ziyarət etməsiylə bağlı ibadət növüdür. Bu ziyarəti yerinə yetirmək üçün fiziki, mənəvi və maddi imkanları olan hər bir müsəlmana həcc vacib sayılır. Daha doğrusu özünün və ailəsinin bir illik dolanacağı olan, fiziki cəhətdən sağlam və ağlı başında olan, mənəvi cəhətdən də həcc etməyə hazır olan, Məkkəyə gedib-gəlməklə bağlı yol xərclərini qarşılamağa qadir olan hər yetkin müsəlman həcc ibadətini yerinə yetirməlidir. Kəbəyə ziyarətin iki növü vardır: həcc və ümrə. Ümrə ibadətini müsəlmanlar bütün il boyu yerinə yetirə bilərlər. Həcc ibadətini isə ancaq həcc ayları olan zilqadə və zilhiccə aylarında yerinə yetirə bilərlər. Həcc ibadətini yerinə yetirən müsəlman təmizlənir, mənən paklaşır.

İslam öyrədir ki, hər bir müsəlman öz malından ehtiyacı olanlar üçün bir hissə çıxarmalıdır. Bu hissə onu yoxsullaşdırmır, əksinə onun malının bərəkətini artırır, nəfsini təmizləyir. Zəkat sözü də elə buradan əmələ gəlmişdir, təmizlik mənasını daşıyır.




### 1.3. İslamda Məzhəblər və Dini Cərəyanlar

İslam dinində məzhəbləri fiqhi və etiqadi olmaqla iki qisimdə incələmək olar. İslamda beş fiqhi məzhəb və iki etiqadi məzhəb mövcuddur.

Fiqh İslam hüququdur. Bu məzhəblər əsasən fiqhi mövzuları müəyyən edib, onları incələyir. Fiqhi məzhəblər bunlardır: Hənəfi, Şafei, Maliki, Hənbəli və Cəfəri məzhəbi.

Hənəfi məzhəbinin qurucusu Əbu Hənifə sayılır (vəfatı - 767). O, “əl-Fiqh ul-Əkbər” kitabının müəllifidir. Bu məzhəb İraqda yaranmışdır. Hənəfilər fiqh məsələlərində ictihada, fəqihin rəyinə geniş yer verirlər. Bu məzhəb mənsubları Türkiyədə, Balkanlarda, Şimalı Qafqazda, Orta Asiyada və Azərbaycanda yayılmışdır.

Maliki məzhəbinin qurucusu Malik ibn Ənəsdir (vəfatı - 795). Onun fiqhə dair məşhur əsəri “əl-Müvatta” dır. Bu məzhəb mənsubları əsasən Mərakeş, Əlcəzair, Tunis, Liviya, Küveyt və Bəhreyndədir.

Şafei məzhəbinin banisi “əl-Ümm” kitabının müəllifi Muhamməd əş-Şafeidir (vəfatı-820). Bu məzhəb Suriya, Fələstin, İordaniya, İraq, Hindistan, Pakistan və Azərbaycan müsəlmanları arasında geniş yayılmışdır.

Hənbəli məzhəbinin əsası Əhməd ibn Hənbəl (vəfatı - 855) tərəfindən qoyulmuşdur. İbn Hənbəl “əl-Müsnəd” fiqh və hədis kitabının müəllifidir. Bu məzhəb Səudiyyə Ərəbistanında rəsmi məzhəbdir.

Cəfərilik isə şiə hüquq məzhəbidir. Əsası altıncı şiə imamı Cəfər əs-Sadiq (vəfatı-765) tərəfindən qoyulmuşdur. Cəfərilərə görə, ictihad qapıları həmişə açıq olmalıdır. Cəfərilik İran və Azərbaycanda geniş yayılmışdır.

İslamda etiqadi məzhəblər əqidə və inanc ilə əlaqəli ayə və hədisləri tam olaraq dəyərləndirən, izah edən və əhli-sünnə inancının əsas nöqtələrini müəyyən edən məzhəblərdir. Etiqadi məzhəblər bunlardır: Maturudi məzhəbi və Əşari məzhəbi. Maturudi məzhəbinin qurucusu Əbu Mənsur Muhamməddir (vəfatı-944). Əşari məzhəbinin banisi isə Əbu Həsən əl-Əşaridir (vəfatı - 873).



| | İLAHİ DİNLƏRİN ƏSAS ÖZƏLLİKLƏRİNƏ ÜMUMİ BİR BAXIŞ | | | | | |
|---|---|---|---|---|---|---|
| **Dinin adı** | **Tanrısı** | **Peyğəmbəri** | **Müqəddəs kitabı** | **Axirət inancı** | **Mənsublarının ən çox yaşadığı bölgələr** | **Müxtəlif dinlərdən keçiş mümkünlüyü** |
| **İslamiyyət** | Allah | Hz. Muhammməd | Qurani-Kərim | Vardır | Asiya, Afrika, Avropa və digər qitələrdə | Ümumbəşəridir. Hər kəs bu dini qəbul edə bilər. |
| **Yəhudilik** | Yahvə | Hz. İbrahim və Hz. Musa | Tövrat | Bəzi məzhəbləri istisna olmaqla | İsrail, ABŞ, və dünyanın bir sıra ölkəsində | Ancaq yəhudi irqindən olan bu dinə mənsub ola bilər. Milli dindir. |
| **Xristianlıq** | Təslis | Hz. İsa | İncil | Vardır | Avropa və Amerika qitəsi başda olmaqla dünyanın hər yerində | Bütün millətlər bu dinə girə bilər. |

İslam dinində həmçinin insan iradəsinin azadlığı, insanın öz əməllləri üçün məsuliyyəti, böyük günah işləmiş insanın aqibəti kimi mövzularını əsas alan Mötəzilə məzhəbi də mövcuddur.

**MÜTALİƏ EDİN!**

Quran bəşəriyyətə, tarixdə tamamilə yeni olan təlim təqdim etdiyi iddiasında deyil. Onun gətirdiyi prinsiplər, Allahın peyğəmbərlər vasitəsiylə Hz. Adəmdən etibarən insanlara göndərdiyi mesajın yenidən xatırladılmasıdır. Allahın insanlardan qəbul etməsini istədiyi mesaj tövhid və onun gerçəkliyində həyatı anlamağı ifadə edən İslamdır. Quran keçmişdəki peyğəmbərlərin təbliğlərini insanlara xatırladaraq onları İslama dəvət etməkdədir. O, bəşəriyyətə Allahın mesajını xatırladan son vəhy, Hz. Muhammməd (s.ə.s) isə son elçidir. Qısacası, Quran, öncəki vəhyləri rədd etməyən, əksinə onları təsdiq edən müqəddəs kitabdır.

Quran özündən əvvəlki vəhyləri doğrulamaqla bərabər özündən öncəki kitabların dəyişdirildiyinə və əslinin pozulduğuna da diqqət çəkir. Quran, həm yəhudiləri, həm xristianları unutduqları və ya fərqliləşdirdikləri Allahın dininə təkrar dəvət etməklə, Allah inancında birləşməyə çağırmaqdadır.

## VIII. YENİ DİNİ CƏRƏYANLAR

Dinlər tarixi fərqliliklərlə doludur. Tarix boyu dinlərin çoxu sabit qalmamışdır. Dəyişən zamanın tələblərinə cavab olaraq, dinlər də dəyişmiş, təhrif olmuş, parçalanıb firqələrə bölünmüşdür. Bəzi dinlər itib getmiş, bəzi dinlər isə yeni forma və məzmun qazanmışdır. Mənəvi axtarışlar insanları gətirib qeyri-ənənəvi yeni dini cərəyanlara gətirib çıxarmışdır. Bu yeni dini cərəyanlar senkretik özəlliyə sahibdir. Yəni insanları özlərinə çəkmək üçün müxtəlif dinlərin özəlliklərini bünyəsində daşıyırlar. Bu dini cərəyanlardan bəzilərinə toxunmaqda fayda var.

### A. Babilik, Bəhailik



Bu dini cərəyan İslam dünyasında ortaya çıxmış senkretik bir dini cərəyandır. Babilik və davamı sayılan Bəhailiyin tarixi Şiə İmamiyyənin bünyəsində olan Şeyxiyyə və Keyfiyyə deyə adlanan təsəvvufi hərəkətləri dayanır. 1844– cü ildə 12-ci imamın qeybə çəkilməsindən min il sonra Şirazda Seyyid Əli adında bir gənc özünü Bab (ərəbcə- “qapı” ) elan etdi. O, deyirdi ki, bu qapıdan tezliklə Allahın bütün insanlara elçisi – Mehdi gələcəkdir. Onun ətrafına çox adam toplanmışdır. Bab öz moizələrində azadlıq, bərabərlik ideyalarına geniş yer ayırırdı. Çağırışları hakim dairələrdə narahatlıq doğurduğundan onu həbs edib və 1850 - ci ildə edam edirlər. Ardıcıllarından 20 min nəfər qətlə yetirilir, çoxu isə İraqa və Fələstinə qaçır. Qaçanlardan Mirzə Hüseyin Əli (1817-1892) adlı birisi 1863-cü ildə özünü gözlənilən Mehdi elan edir və Bəhaullah– “Allahın hüsnü” ləqəibini götürür. Bəhailik də adını buradan alır. Bəhaullah bütün ölkələrin başçılarına məktub göndərib, hərkəsi vahid bir bayraq altında birləşməyə çağırmışdır.



Bəhaullah Qərb mütəfəkkirlərinin ideyalarından çox bəhrələnmişdir. O, Bəhailiyin insanları birliyə, sülhə, dözümlülüyə, qarşılıqlı məhəbbətə çağıran bir din olduğunu deyirdi. Onun fikrincə, dində xurafata yer olmamalı, qadınlar kişilərlə bərabər hüquqlara malik olmalı, var-dövlət və sərvət ədalətlə bölünməlidir. Hamının təhsil haqqı vardır. Hər kəs həqiqət axtarışları üçün fərdi məsuliyyət daşıyır. Bütün dünya xalqları birləşməlidir, çünki bütün insanları bir olan Allah yaratmışdır. Bəhailərin din xadimi yoxdur, amma dini kitabları vardır. Bəhaullahın vəhyləri “Kitabi-Əqdəs” (“Ən müqəddəs kitab”) adı altında toplanmışdır. O deyirdi ki, Allah dərkedilməzdir. Sadə insanlar öz məhdud ağılları ilə Allahın intəhasız təbiətini anlaya bilməzlər. Allah Özünü elçiləri vasitəsilə tanıtdırır. Həmin elçilər dünya dinlərinin baniləridir. Onların vəzifəsi, insanlara Allahın iradəsini dərk etməyə kömək etməkdir. Allah Öz elçilərini hər dəfə insanların yetkinlik səviyyəsinə müvafiq olaraq göndərir. Bəhaullahın elçiliyi zamana ən uyğun elçilikdir.

Bu gün dünyanın 230 ölkəsində təqribən 5 milyon bəhai vardır. Bəhailərin ibadət evləri hamının üzünə açıqdır. Bu evlərin doqquz qapısı və bir günbəzi olur ki, bu da bəşəriyyətin müxtəlifliyinin və eyni zamanda vəhdətinin rəmzidir. Bəhailərin dualarında bütün dini kitabların təsirləri hiss olunur.

Dünya bəhailərinin mərkəzi Ümumdünya Ədalət Evidir. Onun qərargahı İsrailin Hayfa şəhərində yerləşir.

Azərbaycanda bəhailik XIX əsrin axırlarında yayılmağa başlamışdır. 1937-ci ildə tamamilə dağıdılan Bəhai icması, Azərbaycan müstəqillik əldə etdikdən sonra yenidən bərpa edilmişdir.

### B.Yəhova Şahidləri



“Yəhova şahidləri” icmasının əsası 1896-cı ildə Çarlz Teyz Rassel tərəfindən qoyulmuşdur. Bu dini cərəyan Amerika Birləşmiş Ştatlarında ortaya çıxan senkretik dini cərəyandır. Cərəyan 1931-ci ildə “Yəhova Şahidləri” adını almışdır.

Bu dini cərəyanın əsas təbliği, dünyadakı mövcud vəziyyətin yaxın zamanda sona çatacağı və İsa Məsihin təkrar yer üzünə gələrək Tanrının Krallığını quracağı anlayışına əsaslanır. Bu zaman böyük bir məhkəmə qurulacaq, yalnız həqiqi dinin ardıcılları nicat tapacaq, dünya cənnətində öz ölmüş yaxınlarına qovuşacaqlar. Dünya cənnətində aclıq, xəstəlik, ölüm, ağrı-acı olmayacaqdır.

Yəhova şahidləri inanırlar ki, ənənəvi xristian kilsələri Allahın üç sifətdə, Allah-Ata, Allah-Oğul və müqəddəs Ruh sifətlərində təcəlli etməsi, ölümdən sonra ruhun dirilməsi, cəhənnəm əzabı barədə əhkamları ortaya atmaqla İsa Məsihin təlimini təhrif etmişlər. Xristianlığın yeganə düzgün izahını Yəhova şahidləri verir. Yalnız bu dini cərəyanın ətrafında birləşənlər Allahın dərgahına qovuşa biləcəklər.

Yəhova şahidlərinin ibadət məkanları “krallıq salonu” adlanır. Onlar bu məkana heykəl, xaç, şəkil qoymurlar. Camaat üzvləri həftədə 3 dəfə burada toplanır, İncil kitabını oxuyaraq, izah etməyə çalışarlar. Dini camaata “camaat naziri” adlanan şəxs rəhbərlik edir. Ama bu dini rəhbərin özəl bir geyim forması yoxdur. Yəhova şahidləri hər il nizamlı olaraq beynəlxalq toplantılar təşkil edirlər.

1993-cü ildə Yəhova şahidləri icmasının dünyanın 229 ölkəsində 4,5 milyon ardıcılı vardı. İcma 110 dildə dini ədəbiyyat yaymaqla məşğuldur.

Azərbaycanda Yəhova şahidləri icması 1994-cü ildə qurulmuşdur. 1999-cu ildə icmanın 500 nəfərədək üzvü vardı. Üzvlərin əksəriyyəti qadınlardan ibarətdir.

### C. Moonculuq

Bu dini cərəyan, XX əsrdə Şimalı Koreyada ortaya çıxmışdır. Cərəyanın qurucusu, San-Myen Mundur. Munun ardıcılları çox vaxt “Munçular” kimi tanınırlar.

Rəvayətə görə Moon, 1935-ci ildə dağlara çəkilib ibadətlə məşğul olduğu zaman İsa Məsihi röyada görmüşdür. İsa ona demişdir ki, Allah onun çarmıxa çəkilməsini istəməmişdir, Yer üzündə missiyası tamamlanmamış qalmışdır, bu missiyanı tamamlamaq Munun üzərinə düşür. Mun bu missiya barəsində çox düşünmüş, Bibliyanı və başqa kitabları öyrənmiş və dünyada şərin hansı səbəbdən mövcud olduğunu anlamışdır.

Moonculuğun təlimi, Moona vəhy edildiyinə inanılan, müqəddəs kitab kimi təzim olunan, 1957-ci ildə nəşr olunan "İlahi Prinsip" kitabında toplanmışdır. Moonculuğun təliminə görə, insanlığın qurtuluşu ancaq Məsih səviyyəsində heç bir günahı olmayan insan və onun evlənəcəyi müqəddəs bir zövcə sayəsində olacaqdır.

Moon öz təlimini tədricən işləyib hazırlamış və onu "Vəhdət Hərəkatı Prinsipi" adlandırmışdır. Moon İsa Məsihi təqlid edir, onun kimi məhəllədə yaşayan yoxsulların evlərinə gedir, aylıq düyü payını onlarla bölüşdürürdü. O öyrədirdi ki, hər bir insan saleh xristian ola bilər, bunun üçün daim ibadətkar olmaq və hər gün öz günahlarından peşman olub tövbə etmək lazımdır.

1954-cü ildə Moon Dünya Xristianlığının Vəhdəti uğrunda "Müqəddəs Ruh Cəmiyyəti"ni yaratmışdır. Sonralar bu cəmiyyət "Vəhdət Kilsəsi" kimi tanınmışdır.

1992-ci ildə Moon özünü xristianlığın gözlədiyi Məsih elan edir. Moonculuğun özlərinə məxsus ibadət və bayramları vardır. İbadətlər ev və ya bunun üçün qurulan yerlərdə həyata keçirilir. İbadət məkanında Moon və zövcəsinin şəkli olur. Ən əhəmiyyətli ibadət, bazar günü qadın- kişi bərabər yerinə yetirilən bazar ibadətidir.



Moonculuqda ata-anaya itaət əsasdır. Moonculuqda camaat xaricində biri ilə evlənilməsinə icazə verilmir. Moonculuqda hər il nikah mərasimlər həyata keçirilir. Tək evlilik əsas sayılır.

Moon təliminə görə, Allah kainatı yaratmışdır ki, həqiqi məhəbbəti ortaya çıxartsın. Məhəbbəti bəsləmək üçün ailə ilkin özəkdir. Valideynlər öz övladları üçün, övladlar isə valideynləri üçün, ərlər öz arvadları üçün, arvadlar isə ərləri üçün yaşamalıdırlar. Ailədəki mənəvi və əxlaqi tərbiyə əsasında insanlar başqaları naminə yaşamalıdırlar. Bunun üçün insanlar xudpəsəndlikdən əl çəkməli, yalan məhəbbəti özlərindən kənar etməli, bir-birilərini həqiqi məhəbbətlə sevməlidirlər.

**MÜTALİƏ EDİN!**

Munçular adətən arıq və zəif olurlar. Buna səbəb, onların sərt həyat tərzi keçirmələri, az yemək yeyib, az yatmalarıdır. Onların demək olar ki, istirahətə vaxtı qalmır. Gecə-gündüz təbliğat aparır, soyuq su ilə yuyunur, seminarlarda mühazirə oxuyur, yaxud küçələrdə icmalarına yoldan keçənlərdən pul toplayırlar. Munçular özlərini xristian adlandırsalar da, əslində, bu dinlə heç bir əlaqələri yoxdur. Onların etiqadına görə, Tanrı qadın və kişi başlanğıcını özündə ehtiva edən əbədi enerjidir. Mükəmməl ailə isə kainatın əsl yaradılma məqsədidir. Həvvanın günah işlətməsi imanın itirilməsinə və əsl sevginin mahiyyətinin təhrif edilməsinə gətirib çıxarmışdır. Həvva Şeytandan Habili dünyaya gətirməklə Tanrının planını pozmuşdur. Bəşəriyyəti yalnız mükəmməl kişi və mükəmməl qadın arasında bağlanılmış nikah qurtara bilər ki, bütün bu cəhətlər Munun ailəsində cəm olunmuşdur. Beləliklə, Munun vətəni Koreya kainatın mərkəzi, onun özü isə kainatın hökmdarı və xilsakarı sayılır.

## ÖYRƏNDİKLƏRİMİZİ YOXLAYAQ.

**1. İsrail ləqəbi aşağıdakı peyğəmbərlərdən hansının adıdır?**

A) Hz. Süleyman B) Hz. Musa C) Hz. İbrahim D) Hz. Yaqub

**2. Yəhudilərin müqəddəs hesab etdikləri Qüdsdəki məbəd kim tərəfindən tikilmişdir?**

A) Hz. Musa B) Hz. Süleyman C) Hz. Davud D) Hz. İbrahim

**3. Süleyman məbədi yəhudilər üçün nə üçün çox önəmlidir?**

**4. İslamda zəkat ibadətinin cəmiyyətə nə kimi faydaları vardı?**

**5. İslam dinində həcc ibadəti harada yerinə yetirilir?**

A) Qüdsdə B) Mədinədə C) Məkkədə D) Səudiyyə Ərəbistanda

**6. Aşağıdakı cümlələrdə boş buraxılmış qisimləri doldurun.**

Xristianlıqda olan .............., onların Allah inancını göstərir.

Yəhudi tarixində adıyla çox əhəmiyyətli yer tutan ......, bir peyğəmbər deyildir. Yəhudi din alimləri olan rabbilər onu Hz. Musa ilə müqayisə etmiş və onun da Hz. Musa kimi Tövratı almaya layiq olduğunu iddia etmişlər.

*Dünya bəhailərinin başında Ümumdünya Ədalət Evi durur. Onun qərargahı ......................... şəhərində yerləşir.*

**7. Amaterasu, hansı dinin tanrısının adıdır?**

**8. Aşağıdakı dinlərdən hansı ibtidai qəbilə dinlərindən biri deyildir?**

A) Totemizm B) Bütpərəstlik C) Saabilik D) Zərdüşlük

**9. Azərbaycanda Yəhova şahidləri neçənci ildən yayılmağa başlamışdır?**

**10. Xristianlığın əsas üç məzhəbi arasında olan fərqli xüsusiyyətləri sıralayın.**

Katolik məzhəbi Papanın hakimiyyətini qəbul edir, digər iki məzhəb isə Papanın hakimiyyətini qəbul etmir.

........................................................................................................................

.. ......................................................................................................................

........................................................................................................................

**11. İslamın digər dinlərdən ayıran əsas özəlliklərini sıralayın.**

İslamda ruhbanlıq yoxdur.

........................................................................................................................

........................................................................................................................

........................................................................................................................

**12. Aşağıdakı dinlərdən hansı bütün bəşəriyyətə göndərilən dindir?**

A) Xristianlıq B) İslam C) Yəhudilik D) Zərdüştlük

**13. Sakrament nədir?**

**14. Xristianlıqda İsa peyğəmbərin həvariləriylə son axşam yeməyini xatırladan ayinin adı nədir?**

**15. Adının mənası "yol, qanun" olan dinin adı nədir?**

**16. Aşağıdakı dinlərdən hansı Çin və Yapon dinlərinə aiddir?**

A) Hinduizm B) Siqhizm C) Taoizm D) Caynizm

**17. Aşağıdakı məlumatlardan doğru olanları (D) səhv olanları isə (S) şəklində işarələyin.**

A. (..) İslam Hz. Adəmdən Hz. Muhammədə qədərki bütün dinlərə verilən ümumi addır.

B. (..) Məsihçilik anlayışı İslamın əsas inanc şəkillərindən biridir.

C. (..) Hasidilər və Esseylər yəhudi məzhəbləridir.

D. (..) Şintoizm qədim hind dinlərindən biridir.

**18. Aşağıda verilən fikirlər hansı dini inanca aiddir?**

- Dağın da ruhu vardır və dağa qalxmaq istəyən kəs ondan icazə almalıdır. Ağacı kəsməkdən qabaq ondan üzr istənilməsi lazımdır.



# IV FƏSİL

# AZƏRBAYCANDA DİN

## HAZIRLIQ TAPŞIRIQLARI

1. Azərbaycan Tarixi kitablarından müxtəlif dövrlərdə xalqımızın dini adət-ənənələri haqqında geniş məlumat əldə edin.
2. Ensiklopediyalardan “Şeyxülislamlıq” maddəsini tapın və o maddəni oxuyun.
3. Müxtəlif məlumat qaynaqlarında “tolerantlıq” haqqında araşdırma edin və araşdırdığınız məlumatları yoldaşlarınızla paylaşın.

## A. AZƏRBAYCANDA DİNİ ANLAYIŞ



Hər bir ölkədə konstitusiya birdir, dinlər isə çoxdur. Odur ki, qanun mövcud dinlərlə bağlı bütün məqamları və incəlikləri nəzərə ala bilməz: o yalnız universal ümumbəşəri dəyərləri nəzərə ala bilər və buna əsaslanaraq dinin özünü və əqidələri hər bir insanın şəxsi işi hesab edib dindarlarla münasibətlərini qura bilər. Azərbaycana gəlincə ölkəmizdə din dövlətdən ayrıdır. Bütün dini etiqadlar qanun qarşısında bərabərdir. Azərbaycan xalqının dini anlayışı, çox qədim tarixə malikdir və xalqımız dini inanclara, din adamına hər zaman hörmətlə yanaşmışdır. Ölkəmizin tarixində çoxlu müharibələr olub, lakin biz həmişə qürur hissi ilə qeyd edirik ki, onlardan heç biri dini zəmində baş verməyib. Doğrudur SSRİ hakimiyyəti dövründə Azərbaycan xalqının dini inanclarını kökündən yox etmək üçün çox çalışılmışdır. Xalqı ateizm (dinsizlik) rejimində boğmaq istəmişlər. Amma Azərbaycan xalqı dini inancına olan bağlılığı sayəsində bu siyasət qarşısında əyilməmişdir və bu gün Azərbaycan xalqının əsas dini anlayışı İslami dəyərlərə söykənir.



## B. AZƏRBAYCAN KONSTİTUSİYASINDA DİN



Azərbaycan konstitusiyasında olan əsas dini müddəalar bunlardır:

Azərbaycan Respublikası Konstitusiyasının 48-ci maddəsinə əsasən hər bir şəxs vicdan azadlığı hüququna malikdir. Konstitusiyanın 18-ci maddəsinin 1-3 bəndlərində göstərilir ki, Azərbaycan Respublikasında din dövlətdən ayrıdır, bütün dini etiqadlar qanun qarşısında bərabərdir, insan şəxsiyyətini alçaldan, insanlıq prinsiplərinə zidd olan dinləri yaymaq və təbliğ etmək qadağandır.

"Dini etiqad azadlığı haqqında" Azərbaycan Respublikasının Qanunu hər bir şəxsin dinə münasibətini müəyyənləşdirmək və ifadə etmək hüququna və həmin hüququ həyata keçirməyə təminat yaradır.

Həmçinin konstitusiyanın yenə 48-ci maddəsinin II və III bəndlərində göstərilir ki, Hər kəsin dinə münasibətini müstəqil müəyyənləşdirmək, hər hansı dinə təkbaşına və ya başqaları ilə birlikdə etiqad etmək, yaxud heç bir dinə etiqad etməmək, dinə münasibəti ilə bağlı əqidəsini ifadə etmək və yaymaq hüququ vardır. Dini mərasimlərin yerinə yetirilməsi, ictimai qaydanı pozmursa və ya ictimai əxlaqa zidd deyildirsə, sərbəstdir. Dini etiqad və əqidə hüquq pozuntusuna bəraət qazandırmır.

"Dini etiqad azadlığı haqqında" qanunun 4-cü maddəsində isə deyilir ki, hər kəs dini mənsubiyyətindən asılı olmayaraq qanun və məhkəmə qarşısında bərabərdir. Şəxsin dini mənsubiyyətinin rəsmi sənədlərdə göstərilməsinə yalnız onun arzusu ilə yol verilir.

## C.AZƏRBAYCANDA MÖVCUD OLAN DİNLƏR VƏ MƏZHƏBLƏR

Azərbaycanda çoxlu dinlər və təriqətlər mövcud olmuşdur, onlardan ən qədimi isə Zərdüştlük (atəşpərəstlik) sayılır. Azərbaycan ərazisindəki Alban-xristian kilsələrinin tarixi kökləri eramızın IV əsrinin əvvəllərinə təsadüf edir. VII-əsrdə Azərbaycan İslamı qəbul etmişdir və bu gün ölkə əhalisinin 90 faizi müsəlmandır.

Müxtəlif dövrlərdə Bütpərəstlik, Yəhudilik, Xristianlıq, İslam və bir çox başqa dini inanclar ölkədə bu və ya digər dərəcədə yayıla bilmiş, bir-birinə qarşılıqlı təsir göstərmişdir.

### 1. Azərbaycanda yəhudilik





Azərbaycanda üç yəhudi icması - dağ yəhudiləri, Avropa yəhudiləri (aşkenazi) və gürcü yəhudiləri icmaları mövcuddur.

Dağ yəhudiləri hazırda ölkədəki yəhudi diasporu arasında çoxluq təşkil edir. Onların dili tat dilidir, lakin danışıqlarında çoxlu türk, fars və rus sözləri vardır.

Musa Kalankatuklu dağ yəhudilərinin Qafqaza gəlməsini e.ə. I əsrə aid edir. Başqa məlumatlara görə, onlar Şərqi Qafqaza Sasani hökmdarı I Xosrov Nuşirəvan (531-579) tərəfindən köçürülmüşlər.

Dini əqidələrinə görə, dağ yəhudiləri rəbbanilərdir. Onlar Əhdi-ətiqlə yanaşı, Talmutu və ravvin rəvayətlərini də dinin əsas mənbələri hesab edirlər.

Bakı, Oğuz və Qubada dağ yəhudilərinin bir neçə sinaqoqu fəaliyyət göstərir. Qubadakı Qırmızı Qəsəbə bütün postsovet məkanında dağ yəhudilərinin kompakt halda məskunlaşdıqları ən iri yaşayış məntəqəsidir. Ayin orucu günü dünyanın hər yerindən dağ yəhudiləri yaxınlarının qəbirlərini ziyarət etmək üçün buraya gəlirlər. Qəsəbədə üç sinaqoq və mikva vardır.

Azərbaycanda XIX əsrdən məskunlaşmağa başlamış Avropa yəhudilərinin əksəriyyəti Bakı və Sumqayıtda yaşayırlar.

Gürcü yəhudilərinin icması sayca kiçikdir. 1997-ci ildə gürcü yəhudilərinin sinaqoqu bərpa edilmişdir.

**2. Azərbaycanda xristianlıq**

Azərbaycan ərazisində Xristianlıq yeni eranın ilk əsrlərində yayılmışdır və özünün pravoslavlıq, katoliklik və protestantlıq qolları, habelə müxtəlif sektant icmaları ilə təmsil olunmuşdur.

- ***Pravoslavlıq*** Azərbaycanda XIX əsrin əvvəllərindən etibarən rus çarizminin bölgədə yeritdiyi "köçürmə siyasəti" nəticəsində yayılmağa başlamışdır. Bakıda ilk pravoslav kilsəsi 1815-ci ildən fəaliyyət göstərir.

- ***Katolisizm*:** Bakıda ilk Roma-katolik prixodu XIX əsrin 50-ci illərində çar Rusiyası tərəfindən hərbçi katoliklərin Qafqaza sürgün edilməsi ilə əlaqədar olaraq yaradılmışdır.

- ***Baptizm*:** İncilçi-lüteran kilsəsinin ardıcılları Bakıya hələ XIX əsrin 2-ci yarısında neft yataqlarının istismarında iştirak edən alman sənayeçiləri ilə birgə gəlmişlər. Onların gəlişinin bir səbəbi də 19-cu əsrin əvvəllərində Almaniyada baş vermiş siyasi və dini iğtişaşlar olmuşdur. 1937-ci ildə lüteran kilsəsinin keşişləri başqa dini icmaların nümayəndələri ilə birlikdə sürgün edilib, güllələnmişlər. 1994-cü ildə lüteran icması Bakıda yenidən fəaliyyətə başlamışdır.

Azərbaycanda mövcud olan protestantlıq cərəyanın icmaları bunlardır:

- Yevangel-lüteran kilsəsi
- Yevangel xristian baptist icması
- 7-ci gün adventistləri
- “Şərqdə ulduz” xristian İncil dini icması
- Molokan ruhani xristianların dini icması
- Alban-udin xristian dini icması

Azərbaycanda mövcud olan qeyri-ənənəvi dinlər və təriqətlər bunlardır:

- Yəhova şahidləri
- Nehemiya
- Mədh kilsəsi
- Həyatverici lütf
- Beynəlxalq Krişna şüuru
- Bəhailik

## D. DİNLƏRARASI DİALOQ (TOLERANTLIQ) VƏ ONUN PRİNSİPLƏRİ

Dinlərarası dialoq məsələsi hələ XIX-əsrin ortalarında gündəmə gəlsə də, 1950– 60-cı illərdən başlayaraq konkretləşmişdir. Dinlərarası dialoq hər şeydən əvvəl müxtəlif dinlərə etiqad edən insanların görüşərək bir-birinin dinindəki müsbət cəhətləri öyrənmək, aralarındakı ixtilafları müəyyən etmək, qarşılıqlı surətdə zənginləşmək istəyindən irəli gəlir.

Nəzərə alınmalıdır ki, dioloq monoloq deyildir, ikitərəfli və çoxtərəfli olmalıdır. Dialoqda iştirak edən tərəflər öz mövqelərini zamanın tələblərinə uyğunlaşdırmağı bacarmalıdırlar. Əlbəttə, bu o demək deyil ki, dialoqda iştirak edən tərəflər öz mənəvi dəyərləri ilə fəxr etməməlidirlər. Amma onlardan hər biri qarşı tərəfin də dəyərlərini, üstünlük verdiyi əxlaqi keyfiyyətləri başa düşməyə və qiymətləndirməyə çalışmalıdır.

Dialoq fikir və etiqad plüralizminə, özgə dinə hörmətli münasibətə söykənməli, qarşılıqlı əməkdaşlıq əsasında qurulmalıdır.

Dinlərarası dialoqda prespektiv sayılan prinsiplərdən biri də ondan ibarət ola bilər ki, Allahın dini bir, şəriətləri müxtəlifdir, yəni bütün səmavi dinlərin əsasında Allahın bir olduğuna iman durur, qalan şeylər, o cümlədən ibadətlə əlaqəli məsələlər isə hüquq sahəsinə aid olduğu üçün müxtəlif zaman-məkan şəraitində fərqli xüsusiyyət kəsb edə bilər.

Dialoqda məqsəd kimisə hansı əqidəninsə düzgünlüyünə inandırmaq, kiminsə etiqadını dəyişdirmək olmamalıdır. Digər tərəfdən dinlərarası dialoqun geniş yayıldığı bugünkü şəraitdə diqqət dinləri bir-birindən ayıran özəl xüsusiyyətlər üzərində deyil, onları birləşdirən müştərək cəhətlər üzərində cəmləşdirilməlidir. Dinlərarası dialoqdan əvvəl din daxili dialoq olmalıdır. Özü ilə dialoqa girə bilməyən bir din başqa dinlə dialoqa girə bilməz. Din daxili dialoq dinə özünü yaxşı tanımaq və bu təməl üzərində özgəsini də yaxşı tanımaq və öyrənmək imkanı verər.

Dialoqda iştirak edən tərəflər öz missiyalarını səmimi anlamalı və ona məsuliyyətlə yanaşmalıdırlar. Dialoqda riyakarlıq, üstüörtülülük ümumi işə ancaq zərər vura bilər. Dialoqda iştirak edən tərəflərdən hər biri digərini özünə bərabər tutmalıdır, əks təqdirdə dialoq baş tutmayacaq və təsirli olmayacaqdır.



### Azərbaycanda dinlərarası dialoq

Azərbaycan ərazisində yaşayan çoxsaylı etnik və dini qruplar arasında möhkəm əlaqələrin formalaşmasında onların tale ortaqlığı amili də böyük rol oynamışdır. Tarix boyu Azərbaycanda yaşayan xalqlar dəfələrlə qüdrətli dövlətlərdən asılı vəziyyətə düşmüş və yaranmış şərait onları, dünyagörüşlərindəki fərqlərə baxmayaraq, yaxınlaşmağa vadar etmişdir.



Sovet İttifaqının dağılması regionda dini dözümlülük ənənələri üçün əsl sınağa çevrildi. Bu proseslərin nəticəsində keçmiş müttəfiq respublikaların xalqları müstəqilliklə yanaşı əsl dini etiqad azadlığı da əldə etdilər. Barışmaz erməni separatizminin ideoloqları hər imkandan istifadə edərək, Qərbə və Rusiyaya belə bir mif təlqin etməyə çalışırdılar ki, güya Azərbaycandan “İslam təhlükəsi” gözlənilir. Digər tərəfdən, Azərbaycanda anti-müharibə və hətta ermənipərəst meyllərin yayılması üçün bəzi qüvvələr respublikanın müsəlman əhalisinin xristianlaşdırılmasından istifadə edirdilər. Şübhəsiz ki, belə hərəkətlər dinlərarası dialoqun möhkəmlənməsinə xidmət etmirdi.

Qeyd etmək lazımdır ki, bu gün ölkə rəhbərliyi mütəmadi olaraq dini icmaların liderləri ilə görüşür, onların ehtiyac və problemlərinə maraq göstərir. Prezident İlham Əliyev

müntəzəm olaraq ölkənin xristian və yəhudi icmalarını əsas dini bayramlar münasibətilə təbrik edir.

Azərbaycanda tolerantlığın formalaşmasında dini liderlərin konstruktiv mövqeyi də böyük rol oynayır. Bu baxımdan 26 noyabr 2003-cü ildə Moskva şəhərində keçirilən cənubi Qafqaz ölkələri və Rusiyanın dini liderlərinin görüşünü müsbət qiymətləndirmək olar.

## E. DİNİ DÖZÜMLÜLÜK

Biz müxtəlif dinlərlə tanış olduq. Gördük ki, bu dinlərdən hər biri hansısa bir ölkənin, bir xalqın dini olmaqdan çıxmış, müxtəlif ölkələrə yayılmışdır.

Bu gün miqrasiya prosesləri güclənir, cəmiyyətlər bir-biri ilə qaynayıb qarışır. Şübhəsiz, bu hal dinlərin də coğrafiyasını genişləndirir. Belə bir şəraitdə dinlərin yanaşı yaşaması, dini dözümlülük problemi ortaya çıxır.

Hər ölkədə bir din başqa dinlərə nisbətən daha qədim köklərə, daha geniş sosial bazaya malik olur. Bu din həmin ölkədəki digər dinlərə nisbətən insanlar arasında daha geniş yayılır daha çox tanınır və ölkənin rəsmi dini də bu din hesab edilir. Bu o dinin ölkədəki dini dözümlülüyünü göstərən əsas amil sayılır.

Tarixdə müharibə, sürgün və s. səbəblərdən müxtəlif dinlərə məxsus insanların birgə yaşamaq məcburiyyətində qaldıqları danılmazdı. Bu hadisələr qarşısında bəzi dinlər dözümlülük göstərə bilmiş, bəzi dinlər də bu dözümlülüyü göstərə bilməmiş və nəticədə dinlər bir-birindən təsirlənmişdir. Nəticədə dinlər arasında dini inanc və adət-ənənə mübadiləsi halları baş vermişdir. Bəzən də bir neçə dinin özəlliklərini özündə cəm edən senkretik dinlər ortaya çıxmışdır.



### Azərbaycanda dini dözümlülük

Azərbaycan tarixən müsəlman ölkəsidir, burada əhalinin 90%-dən çoxu müsəlmandır. Lakin burada yəhudi və xristianlar da yaşayır. Bundan əlavə, son vaxtlar Azərbaycanda qeyri-ənənəvi dinlər, xristian sektaları, İslam firqələri də yayılmaqdadır. Bu o deməkdir ki, dinlər və bu dinlərin ardıcılları bir-birinə dözməli, dözümlülük gəstərməlidir. Bu baxımdan Azərbaycan həqiqətən nümunə ola bilər. ATƏT-in Demokratik Təsisatlar və İnsan Haqları Bürosunun direktoru Jerar Ştudman bu nüfuzlu təşkilatın Bakı konfransında (10-11 oktyabr 2002) demişdir: ”Azərbaycanda dini dözümlülük heç də yeni konsepsiya deyildir. Bu ölkə yüz illər boyunca müxtəlif mədəniyyətlərin yanaşı yaşamasına, dözümlülüyə bariz nümunə ola bilər”.

Azərbaycanda dini dözümlülüyün tərbiyə edilməsində İslamın da rolu az olmamışdır. Bu din **“Sizin hər biriniz üçün bir şəriət və bir yol təyin etdik”** (əl- Maidə, 48) deməklə dini plüralizmi prinsip etibarilə məqbul saymışdır. İslamın “Dində məcburiyyət yoxdur” prinsipi isə dini dözümlülüyü müsəlmanlar üçün hökm səviyyəsinə qaldırmışdır. Məşhur Avropa tarixçisi Adam Mets “İslam İntibahı” kitabında İslamın başqa dinlərə münasibətdə daha dözümlü olduğuna dair çoxlu nümunələr göstərir.

## F. ŞEYXÜLİSLAM VƏ ŞEYXÜLİSLAMLIĞIN QISA TARİXİ

“Şeyx əl- İslam” ünvanı X əsrin ikinci yarısında ortaya çıxan şərəf ünvanlarından biridir. İslam sözü ilə təşkil olunan digər şərəf ünvanlarının (calalülislam, izzülislam, seyfülislam kimi) dünyəvi iqtidar sahibləri (məs, Fatimi vəzirləri) tərəfindən işlənməsinə müqabil şeyxülislam ünvanı, daima üləmalara və sufilərə xas olmuşdur. Digər ünvanların içində yalnız şeyxülislam böyük ərazidə yayıla bilmişdir. XI əsrdə Xorasandakı şafeilərin rəisi olan İsmayıl ibn Əbdürrəhman şafeilər tərəfindən şeyxülislam adlandırılmışdır. Həmçinin XII əsrdə Fəxrəddin Razi də şeyxülislam hesab olunurdu.

Məmlüklər dövrünün başlanğıcında şeyxülislam, sadəcə fəqihlərə, fitvaları ilə şöhrət qazanmış fiqh alimlərinə verilən (qeyri-rəsmi) şərəf ünvanına çevrilmişdir. Beləliklə, h.700-cü (1300) ilə qədər şeyxülislam ünvanı şöhrət qazanmış hər müftünün özünə götürə biləcəyi bir ünvan olmuşdur. Misirdə və Rusiyada son zamanlar, Türkiyədə isə XVIII əsrə qədər müftülər bu ünvanla adlandırılırlar. İranda və Azərbaycanda bu ünvanın inkişafı başqa istiqamətdə olmuşdur. Burada şeyxülislam, hər mühüm şəhərdə molla və müctəhidlərin dini məhkəmə heyətinə rəyasət edən yüksək məhkəmə məmuru idi.

### Azərbaycanda şeyxülislamlıq



Azərbaycanın Rusiya imperiyasına ilhaq edilməsindən sonrakı dövr ölkənin islamlaşmasının yeni mərhələsi kimi nəzərdən keçirilə bilər. Bu mərhələnin ən səciyyəvi xüsusiyyəti hökumətin müsəlman din xadimlərini ələ almaq və özünə tabe etmək məqsədilə xristianlıqdakı kilsə strukturuna bənzər islam dini qurumu yaratmaq siyasəti ilə bağlıdır. Rus çarının 29 noyabr 1832-ci ildə Senata göndərdiyi məktubda Zaqafqaziya müsəlmanlarının dini işlər idarəsi barədə əsasnamə hazırlanması təklif olunurdu. Lakin hazırlanmış layihələrin heç biri bəyənilmədi. 1849-cu ildə Qafqaz canişini knyaz Vorontsovun tapşırığı ilə xarici işlər nazirliyinin əməkdaşı N.Xanıkov "Muhammədi ruhanilərin təşkili barədə əsasnamə" layihəsini hazırladı. Layihə bütövlükdə bəyənilsə də Krım müharibəsi onun həyata keçirilməsini ləngitdi. 1864-cü ildə həmin işi davam etdirmək üçün yeni komissiya yaradıldı, yerli şiə və sünni məzhəblərinin nümayəndələri də komissiyanın tərkibinə qatıldılar. Hazırlanan təlimatlar müsəlman ruhanilərinin vəzifələrini, hüquq və imtiyazlarını, dünyəvi hakimiyyətlə münasibətlərini tənzimləyirdi. 1867-ci ilə qədər hökumətdən yalnız şeyxülislam və müftü maaş alırdılarsa, bu ildən etibarən digər yüksək rütbəli müsəlman ruhaniləri də maaş almağa başladılar.

"Zaqafqaziya şiə və sünni Muhammədi ruhanilər idarəsi haqqında əsasnamə" dövlət şurasının təqdimatı ilə Rusiya çarı tərəfindən 5 aprel 1872-ci ildə təsdiq edildi. İdarənin təşkilində rus pravoslav kilsəsinin quruluş prinsipi əsas götürülmüşdü. Cənubi Qafqazda 2 müsəlman inzibati orqanı - müftünün başçılığı ilə sünni ruhani idarəsi (müftilik) və şeyxülislamın sədrliyi altında şiə ruhani idarəsi (şeyxülislamlıq) yaradıldı. Hər iki idarənin tabeliyində Tiflis, İrəvan, Yelizavetpol (Gəncə) və Bakı quberniyalarının hərəsində 1 məclis

olmaqla 4 məclis var idi. Sünni idarəsində 16, şiə idarəsində 20 qazı vardı. İdarələr Daxili İşlər Nazirliyinin nəzarəti altında idi və birbaşa canişin qarşısında məsuliyyət daşıyırdı.

Azərbaycan Demokratik Respublikası (1918-1920) yaranana qədər cənubi Qafqaz müsəlmanlarının dini işləri bu iki idarə tərəfindən tənzimlənmişdir. 1920-ci ildə Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra mayın 15-də "Dini etiqad işləri nazirliyi" və "Şeyxülislamlıq" təsisatı buraxılır, müsəlman din xadimləri təqiblərə məruz qalır, məscidlərin əksəriyyəti bağlanır. 1943-cü ildə faşist Almaniyasına qarşı mübarizədə dinin imkanlarından istifadə məqsədilə Zaqafqaziya müsəlmanlarının dini qurumunun yaradılması məqsədəuyğun hesab edilir.

Zaqafqaziya müsəlmanlarının I qurultayı 25-28 may 1944-cü ildə Bakıda keçirilir və mərkəzi Bakıda olmaqla Zaqafqaziya Müsəlmanları Ruhani İdarəsi yaradılır. Axund Ağa Əlizadə şeyxülislam seçilir. O, idarənin tarixində seçilmiş ilk şeyxülislamdır, ona qədər şeyxülislamlar dövlət tərəfindən təyin edilirdilər. Zaqafqaziya Müsəlmanları Ruhani İdarəsi vahid mərkəz olur və şeyxülislam tərəfindən idarə olunur, müftü idarə sədrinin birinci müavini sayılır və sünni məzhəb müsəlmanların şəriətlə bağlı məsələlərini tənzimləyir.

Hazırda bu idarə Qafqaz Müsəlmanları İdarəsi kimi dövlət qeydiyyatından keçərək fəaliyyət göstərir və İslam təmayüllü digər dini icmaların tarixi mərkəzi hesab olunur. Bugün Qafqazın XII Şeyxülislamı, Qafqaz Müsəlmanları İdarəsinin Sədri, Qafqaz Xalqları Ali Dini Şurasının Sədri, professor doktor Hacı Allahşükür Paşazadədir.

## ÖYRƏNDİKLƏRİMİZİ YOXLAYAQ.

1. **Azərbaycan konstitusiyasına görə, Azərbaycanda mövcud olan dini anlayışı izah edin.**
2. **Sovet hakimiyyəti əsarətində olduğu illər ilə müstəqillik qazandıqdan sonrakı illəri müqayisə edərək, Azərbaycanın dini zəmində mövcud olan fərqliliklərini göstərin.**
3. **Zaqafqaziya müsəlmanlarının I qurultayı nə zaman və harada keçirilmişdi?**

   A) 28 may 1990-cı ildə Bakıda

   B) 31 oktyabr 1995-ci ildə Gəncədə

   C) 12 noybar 1980-cı ildə Tiflisdə

   D) 25-28 may 1944-cü ildə Bakıda
4. **Bakıda ilk pravoslav kilsəsi nə zaman tikilmişdir?**

   A)1825 B)1815 C) 1845 D) 1985
5. **Aşağıda verilmiş cümlələrdə boş buraxılmış qisimləri doldurun.**
   - 1849-cu ildə Qafqaz canişini knyaz ............ tapşırığı ilə xarici işlər nazirliyinin əməkdaşı N.Xanıkov "Muhammədi ruhanilərin təşkili barədə əsasnamə" layihəsini hazırladı.
   - *Dinlərarası dialoq hər şeydən əvvəl müxtəlif ......... etiqad edən insanların görüşərək bir-birinin dinindəki müsbət cəhətləri öyrənmək, aralarındakı ............. müəyyən etmək, qarşılıqlı surətdə zənginləşmək istəyindən irəli gəlir.*
6. **Azərbaycanda mövcud olan yəhudi icmaları içərisində çoxluq təşkil edən yəhudi icması hansıdır?**

   A) Dağ yəhudiləri

   B) Gürcü yəhudiləri

   C) Avropa yəhudiləri

   D) Alman yəhudiləri
7. **Azərbaycan Demokratik Respublikası (1918-1920) yaranana qədər cənubi Qafqaz müsəlmanlarının dini işləri necə tənzimlənirdi?**
8. **Azərbaycanda mövcud olan xristian icmaları hansılardır?**

## İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT


Azərbaycan Respublikası Prezidentinin işlər idarəsinin prezident kitabxanası, *Azərbaycanda Din.*

Azərbaycan Respublikasının Konstitusiyası, Qanun, Bakı - 2006.

Dr. Saleh İnci, *Dinlər Tarixi Dərs Kitabı,* İstanbul - 2012.

E. M. Əsgərov; N. Ə. Rəhimov, *Fəlsəfə, Tarix və Əxlaq baxımından İslamın Əsasları,* Avropa Nəşriyyatı, Bakı - 2007.

Heyət, Ayna Uşaq Ensiklopediyası, *Din Əxlaqa aparan yol,* Ayna Mətbu evi, Bakı 2004.

Heyət, *Qarşılaşdırmalı Dinlər Tarixi*, Dərgah Yayınları, İstanbul-2012.

Prof. Dr. Əkrəm Sarıqçıoğlu, *Başlanğıcdan günümüzə Dinlər Tarixi*, İsparta-2000

Prof. Dr. Günay Tümər, Prof. Dr. Əbdürrəhman Küçük; *Dinlər Tarixi*, IV nəşr, Ocaq Yayınları, Ankara - 2002

Prof. Dr. Həmdi Döndürən, *Dəlilləriylə İslam Elmihalı,* Ərkam yayınları, İstanbul - 1991.

Rafiq Əliyev, *Dövlət və Din,* İrşad İslam araşdırmaları mərkəzi, Bakı - 2004

Ziya Bünyadov, *Dinlər, Təriqətlər və Məzhəblər,* Şərq-Qərb mətbəəsi, Bakı - 2007.